H 18 (93)

**Redaktoru VASİF QULİYEV**

Tərtib edənləri, əski əlifbadan çevirən və işləyənləri
filologiya elmləri namizədi *Kamandar Şərifli* və *Arif Ramazanzadə*dir.

H 18 (93)

**Mir Möhsün Nəvvab.** «1905—1906-cı illərdə erməni-müsəlman davası».
— Bakı, «Azərbaycan». nəşriyyatı, 1993. — 128 s.

H 4804000000 — 018 (93) H 18 (93) Azərb.
M 670 (07) — 93

# QANLI-QADALI İLLƏRİN DƏYƏRLİ ABİDƏSİ

Artıq altıncı ildir ki, ortaya atılmış süni Dağlıq Qarabağ probleminin tarixi köklərinin öyrənilməsi, onu ortaya atmış erməni millətçiləri və onların havadarlarının niyyətlərini ifşa etmək baxımından Mir Möhsün Hacı Mirəhməd oğlu Nəvvabın (1833-1918) indiyədək elm aləminə məlum olmayan «Təvarixi-rəzm və şurişi tayifeyi-ərəməniyeyi — Qafqaz ba firqeyi müsəlmanan» («Qafqaz erməni tayfası ilə müsəlmanların vuruş və iğtişaş tarixləri») əsəri son dərəcə əhəmiyyətlidir. M. M. Nəvvab yaşadığı dövrdə baş verən hadisələrdən kənarda qalmamış, tariximizin ən faciəli, qanlı səhifələrindən birini təşkil edən 1905-1906-cı illərdə rus imperiyasının fitnə-fəsadı və onun qəsbkar ordusunun köməyi ilə erməni millətçilərinin xalqımızın üzərinə qaldırılması nəticəsində baş vermiş qırğınları qələmə almışdır.

Əsərdə 1903-1904-cü illərdə Şuşada və Qarabağın başqa kəndlərində erməni millətçilərinin Azərbaycan türklərinə qarşı törətdikləri cinayətlər haqqında ayrı-ayrı epizodlarda geniş məlumat verilir. Müəllifin yazdıqlarından aydın olur ki, o vaxt da mərkəzdən bu iki millətə münasibət fərqli olmuşdur. M. M. Nəvvab qeyd edir ki, çarın əmrilə silah gəzdirmək Azərbaycan türklərinə qəti qadağan edilmişdi. Bundan istifadə edən silahlı erməni dəstələri silahsız azərbaycanlıları asanlıqla tutmağa və min cür əzabla öldürməyə müyəssər olurdular. Onlar fürsət düşən kimi istər azərbaycanlı, istərsə də Osmanlı türklərinə hər cür maddi, mənəvi və fiziki zərbələr endirməyə çalışmışlar. Əsərdə deyildiyi kimi, hətta 1877-ci il Rusiya—Türkiyə müharibəsi zamanı rus ordusunun tərkibində Qars şəhərinə daxil olan ermənilər orda əllərinə keçən əlyazma kitablarını və Qur'ani-Şərifi amansızcasına yandırmışlar.

M. M. Nəvvab yazır ki, erməni millətçiləri əvvəl Osmanlı dövlətində, sonra isə Rusiya şəhərlərində xüsusi qımdatxanalar (müasir saqqallı erməni quldurlarının əcdadlarını türklərə qarşı birləşdirmiş mərkəzlər) yaratmışdılar. Ora ziyalılar, cavanlar, sənətkarlar və erməni icmasının başqa nümayəndələri cəlb olunurmuş. Osmanlı və Azərbaycan türklərinə qarşı təbliğatda, təxribatda, sui-qəsddə, eləcə də, silahlı toqquşmalarda istifadə etmək üçün lazımi hərbi sursatın, çar məmur və zabitlərinin rüşvətlə ələ keçirilməsi məqsədilə varlı erməni təbəqələrindən pul toplamaq qımdatların əsas vəzifələrindən biri idi.

İstər qımdatlara, istərsə də başqa erməni millətçi dəstələrinə xeyir-dua verən, onların xalqımıza qarşı törətdikləri qanlı cinayətlərin, qırğınların əsas təşkilatçısı yerlərdə fəaliyyət göstərən kilsələr və kilsə xadimləri olmuşlar. Onlara isə ümumi rəhbərliyi Eçmiədzin (Üç müəzzin) etmişdir.

Kilsənin toxunulmaz Tanrı məbədi olduğunu nəzərə alaraq keşişlər onu 1905-1906-cı illərdə xalqımıza qarşı erməni quldur dəstələrini silahlandıran hərbi sursat cəbbəxanasına çevirmişdilər. 1906-cı ildə Şuşada ardı-arası kəsilməyən bu qırğınlardan cana doymuş bir neçə erməni Şuşa kilsələrinin yeraltı qatlarında məxfi

hərbi sursat anbarları olması haqqında gizlicə şəhər üsul-idarəsinin başçısı olan rus generalına xəbər verərək həmin anbarların ləğv edilməsini tələb edirlər. Yoxlanış zamanı iki kilsənin yeraltı qatından çoxlu miqdarda tüfəng, güllə, top, bomba, dinamit, evlərin yandırılmasında istifadə etmək üçün müxtəlif maddələrlə doldurulmuş silah anbarları aşkar edilmişdi. Kilsənin əsas fəaliyyəti ilə daban-dabana zidd olan bu əməllərinə görə Ter-Ovanesyan, Ter-Arsen Vartapetov, Ter-Karapet Vartapetov, Mirzəbekov, Asatur Vartapetov kimi keşişlər sadəcə olaraq Şuşadan uzaqlaşdırılmışdılar.

Bəzilərinə təəccüblü görünər ki, insanlığı mənəvi paklığa çağıran, onlara pislikdən, ədavətdən, zalımlıqdan əl çəkməyi tövsiyyə edən, adamları ədalətə, xeyirxahlığa, haqq yoluna dəvət edən Tanrı məbədinə ölüm, qan qoxusu verən və kilsə qanunlarına tamamilə daban-dabana zidd olan silahların orda toplaşması, saxlanması və quldur dəstələrini silahlandırıb, başqa bir xalqa və onun torpağına qarşı təcavüzə yönəltmək mümkün olan şeydirmi?!

Əgər biz XX yüzilliyin lap əvvəllərindən başlayaraq bu günümüzədək erməni millətçiləri tərəfindən xalqımıza qarşı törədilən aşkar və gizli qırğınlara, torpağımıza şərik və sahib olmaq məqsədilə aparılan təbliğatlara və silahlı vuruşmalara dair Çar Rusiyasında və keçmiş SSRİ-də, eləcə də xarici ölkələrdə yazılmış onlarla məxəzi izləmiş olsaq, görərik ki, elə bu iki millət arasında ədavəti qızışdıran və təşkil edən başlıca qüvvə kilsə və onun ətrafına toplanmış erməni «ziyalıları» olmuşlar.

İki millət arasında davam edən iğtişaş və qırğınlar zamanı kilsənin fəaliyyətini dərindən öyrənmiş rus diplomatı, general Mayevski öz qeydlərində yazır: «Erməni din xadimləri haqqında bir neçə söz demək istəyirəm. Onların dini fəaliyyəti olduqca cüzidir. Erməni din xadimlərinin fəaliyyəti «Allah kəlamını» çatdırmaqdan çox, müsəlmanlarla xristianlar arasında nifaqı qızışdırmaqdan ibarətdir». Vaxtilə Eçmiədzinə səfər etdikdən və onun fəaliyyətilə yaxından tanış olduqdan sonra fransız alimi Baron de-Bay belə yazmışdı: «Bu kilsə bir müddət saxta pul düzəldənlərin yuvası olmuşdur... Mənim bütün minnətdarlıqlarıma baxmayaraq, mən səmimi olmalıyam. Bu monastır məndə dini mərkəzdən çox siyasi mərkəz təəssüratı yaratdı».

Erməni kilsəsinin belə qeyri-insani fəaliyyətini işıqlandıran ayrı-ayrı məxəzlərdən çoxlu nümunələr gətirmək olar. Son dövrlərdə də istər xaricdə, istərsə də daxildə olan erməni mafiyasının ən qüdrətli dayaqlarından biri, terror və təbliğat şəbəkələrinin təşkilatçısı, onu maddi cəhətdən təmin edən kilsə olmuşdur.

Mir Möhsün Nəvvabın haqqında danışdığımız əsəri hal-hazırda istər Dağlıq Qarabağda, istərsə də digər bölgələrdə gedən müharibənin səbəblərinin, onun tarixi köklərinin və erməniləri dəstəkləyən qüvvə və tərəflərin öyrənilməsində və xarici qüvvələrin bu bölgədə apardıqları siyasətin aşkarlanmasında dəyərli məlumatlar verəcək.

**Kamandar ŞƏRİFLİ.**

# GİRİŞ

İzzətli və mehriban qardaşlarım, hüzuruna böyük ehtiramla, Nəvvab Mir Möhsün mərhum Hacı Seyid Əhməd Ağamirzadə Qarabaği oğlu ərzi-əhval edir ki, bu vaxtlar, yəni hicri 1323-cü (miladi 1905) ildə Qafqaz vilayətində və bir para xarici ölkələrdə ermənilərlə müsəlmanlar arasında baş vermiş iğtişaşların və qırğınların bir parasını müxtəsər şəkildə yadigar qalmaq üçün Azərbaycan türkisində qələmə aldım.

Əvvəla, bunu bilmək lazımdır ki Qafqaz vilayətləri müsəlman padşahlarına, ələlxüsus, İran şahlarına tabe olub. Elə ki, Qafqaz vilayətlərində, o cümlədən, Azərbaycanda ayrı-ayrı xanlıqlar yaranaraq İran tabeliyindən çıxdılar, bu zaman, yəni hicri 1161-ci (miladi 1748) ildə Pənah xan Bayatda bir qala tikdirdi. Bir az müddətdən sonra həmin qalanı tərk edib hicri 1165-ci (miladi 1751) ildə Tərnəkütdə başqa bir qala bina etdi. Beş il istər-istəməz o qalada qaldı. Əyanlar Pənah xanın bu qalaya meylsiz olduğunu hiss edib ona müraciət etdilər ki, əgər məsləhət bilsəniz, gözəl havası olan səfalı, hündür bir yer var ki, orda yeni bir qala tikdirərdin. Ora müdafiə baxımdan da münasib bir mövqedə yerləşir. Pənah xan öz əyanları ilə gəlib həmin yerə baxarkən gördü ki, ora hündür bir yerdir, dörd ətrafı uca qayalar və dağlarla əhatə olunmuşdur. Uçan quşlardan başqa insan və heyvan həmin qayalarla qalxıb-enməyə qadir deyil. Bura yalnız iki tərəfdən—şərqdən və qərbdən gediş-gəliş yolları var. Pənah xan həmin yeri bəyənib bildirdi ki, çox yaxşı möhkəm şəhər yeridi. Lakin nə fayda ki, kifayət qədər axar suyu və çayları yoxdu. Sonra xanın əmri ilə kənkanlar gəlib orda bir neçə yerdə quyular qazdılar. Quyulardan yaxşı su çıxdı. Lakin şor idi.

Hicri 1170-ci (miladi 1756) ildə Pənah xanın əmrinə əsasən həmin yerdə bir qala tikildi və həmin qala Pənahabad qalası adlandırıldı. İndi həmin qalaya Şuşa qalası deyirlər. Get-gedə həmin qala abadlaşdırılaraq şəhərə çevrildi. Burda zərbxana tikdirilərək pul kəsilməyə başladı. Burda sikkələr kəsilirdi. Qarabağda Pənah xanın hakimiyyəti İran padşahının onu İrana aparana qədər davam etmişdi (Xan İrana aparılanda orada vəfat etmişdi[1]).

Pənah xandan sonra İbrahim Xəlil xan öz atasının yerində oturub hökmranlıq etmişdi. İbrahim Xəlil xan Qalanın (xalq arasında Pənahabad şəhəri Qala adı ilə də məşhur idi) abadlığına böyük əhəmiyyət verərək onun ətrafında çoxlu kəndlər salmışdı. Bununla da get-gedə onun xanlığı qüvvətlənmiş və özü böyük şöhrət tapmışdı.

İran padşahı Ağa Məhəmməd şah Qacar saysız qoşunla Qarabağa hücum etdikdən sonra Qalaya daxil olarkən İbrahim Xəlil xan Dağıstan tərəfə qaçmışdı.

[1] Ancaq deyilənə görə, Pənah xan İranda vəfat etməsinə baxmayaraq, vəsiyyətinə görə onu gətirib Ağdamda İmarətdə dəfn etmişlər.

Ağa Məhəmməd şah Qacar isə xanın oğlu Məhəmməd Həsən ağanın evini özünə iqamətgah seçmişdi.

Ağa Məhəmməd şah Qacar bir gün Səfərəli adlı bir nökərini cinayət etdiyinə görə hədələyib, buyurur ki, sabah müqəssirlərin hamısının başını kəsdirib bir minarə tikdirəcək və Səfərəlinin başını lap yuxarıda qoyduracaq. Həmin Səfərəli şahın qapısında keşikçi durardı. O gecə bir yoldaşı ilə birlikdə gecədən xeyli keçdikdən sonra şahın yatdığı evə daxil olub, xəncər ilə şahın qarnını yırtıb öldürürlər.

Bu hadisə hicri 1211-ci (miladi 1796) ildə baş vermişdi. Şah öldürüldükdən sonra qoşun dağılıb İrana qayıtdı və İbrahim Xəlil xan gəlib öz yerində qərar tutdu. Ağa Məhəmməd şahın vəliəhdi Fətəli şah hadisədən xəbərdar olduqdan sonra oğlu Abbas Mirzənin sərkərdəliyi ilə yenidən Qarabağa qoşun yeritdi. Bu əhvalatdan xəbər tutan İbrahim xan qorxuya düşdü. Dərhal öz oğlu Məhəmməd Həsən ağanı Gəncəyə rus sərdarının yanına göndərib ondan kömək istədi.

Rus sərdarı on min qoşun götürüb Məhəmməd Həsən ağa ilə birlikdə Qarabağa gəldi. İbrahim Xəlil xan əmirlilərdən və cəbrayıllılardan bir qədər atlı götürüb rus sərdarının qabağına gəldi. Görüşdən sonra onlar Araz çayı tərəfə İran qoşununun qarşısına hərəkət etdilər. Aslandüz deyilən yerdə İran qoşunu ilə qarşı-qarşıya gəlib, bir az döyüşəndən sonra azsaylı İran qoşunu geri çəkilib İrana qayıtdı. Vuruşdan sonra İbrahimxəlil xan öz atlıları və rus qoşunu ilə birlikdə geri dönüb qalaya tərəf üz qoydular. Gəncə-Qarabağ yol ayrıcına çatarkən rus sərdarı irəli çıxıb xanla əl tutduqdan sonra dedi ki, cənabınızın Qalasını çox tərifləyirlər. Amma təəssüflər olsun ki, mən sizin Qalaya tamaşa edə bilmədim. Yazıq xan safürəkliliyindən rus sərdarının bu hiyləsini anlamayıb buyurdu ki, nə eybi var, Gəncəyə bir neçə gün gec gedərsiniz. Buyurun, gedək bir-iki gün bizə qonaq olun. Qalaya tamaşa edin. Sərdar bir az fikirləşdikdən sonra dedi ki, bir gecə-gündüz hüzurunuzda qonaq olmaq asandır. Bu söhbətdən sonra onlar qoşunla Qalaya tərəf üz qoydular. Xan bağı deyilən yerə çatarkən sərdar qoşuna əmr etdi ki, bu qədər adamın şəhərə girməyinə ehtiyac yoxdur. Bir neçə yüz nəfər mənimlə Qalaya gəlsin, qalan qoşun biz geri qayıdanacan burda gözləsin. Rus sərdarı neçə yüz əsgər götürüb, Qalaya xanın hüzuruna gəldi. Qalaya daxil olan kimi sərdar dönüb rusca öz əsgərlərinə əmr edərək sıraya düzdü. Xan soruşdu ki, nə üçün əsgərləri sıraya düzdünüz. Sərdar buyurdu ki, əsgərləri sizin şərəfinizə sıraya düzdüm. Bundan sonra sərdar rusca əsgərlərə nə dedisə, onlar tələsik yüyürüb bürc və barı üstünə çıxaraq şeypur çalmağa başladılar. Həmin saat Xan bağı tərəfdən Kəhrab deyilən yerdən də şeypur çalındı. Xanı təəccüb götürdü. Çox keçmədi arxada qalan əsgərlər də gəlib Qalaya daxil oldular.

Sərdar xanın qabağına gəlib dedi ki, biz artıq bu Qalanı zəbt etdik. Əgər sən rus padşahına bu qala və bütün dövlətinlə tabe olursansa, hakimiyyət sənin əlində olacaq. Yox əgər tabe olmaq fikrində deyilsənsə, sənə üç saat möhlət veririk, imarətindən nə ehtiyac duyursan, götürüb istədiyin yerə gedə bilərsən.

Xan bu xəyanətdən çox təsirlənib rus sərdarına təhqiramiz sözlər dedi. Rus sərdarı buyurdu ki, artıq danışmaq lazım deyil. Bu şəhəri biz tutmuşuq və sənə üç saat möhlət vermişik. İstədiyini edə bilərsən.

Yazıq xan əlacsız qalıb öz imarətinə gəldi. Bacardığı qədər lazım olan əşyaları, övrət-uşağı götürüb bütün atlı-piyada nökər və qoşunları ilə Qaladan çıxdılar. Qalanın yaxınlığında üstü hamar olan qayalıq yerdə çadırlar qurub məskən saldılar. Çadırlarda və alaçıqlarda yaşayan xanın və onun adamlarının əmin-amanlığını təmin etmək üçün ətrafda səngərlər qazdılar. Dərhal xanın əmrilə münşilər İran şahı Fətəli şaha bir ərizə yazdılar. Ərizədə xan yazırdı ki, rus sərdarı hiylə ilə mənim başıma belə işlər gətirdi. Mən indi bütün adamlarımla çıxıb Qaladan kənar bir dağın üstündə məskən salmışam. Sədaqətlə bu ərizəni hüzurunuza göndərirəm ki, mənə kömək əlinizi uzadasınız. Bundan sonra cənabınıza tabe oluram. Xan həmin ərizəni bir Qur'ani-Şərifin arasına qoyub, onu da möhürləyib, şaha göndərdi. Bunun da mənası o idi ki, and olsun bu Qur'ani-Şərifə ki, cənabınıza tabe olacağam.

Şahənşah ərizəni alan kimi dərhal 12 minlik qoşun toplayıb, topxanası ilə birlikdə İbrahimxəlil xanın oğlu Əbülfət ağanın sərkərdəliyi ilə xanın köməyinə göndərdi.

Bu tərəfdən rus sərdarını bu əhvalatdan xəbərdar etdilər. Sərdarın əmri ilə həmin saat gecə vaxtı bir neçə yüz əsgər toplanıb, xəbər gətirən adamın sərəncamına verildi.

Qoşun aşağı bürcün altında yerləşən lağımdan keçərək Şuşakəndə gəldi.

Qoşunun başçısı Şuşakənddən bir neçə erməni bələdçisi götürüb dağların ətəkləri ilə gizlincə İbrahimxəlil xanın məskən saldığı yerə tərəf hərəkət etdilər. Qoşun xanın səngərlərinə çatarkən İbrahimxəlil xan çadırında öz dövlət əyanlarının əhatəsində əyləşib, söhbət edə-edə qızıl qəlyan çəkirdi. Bu məclisdə mənim, yəni, bəndeyi-həqir Nəvvab Mir Möhsünün ana babası mərhum Əmiraslan bəy də iştirak edirdi. Birdən xana xəbər verdilər ki, rus qoşunu sənin üstünə gəlir, Xan qalxıb neçə dəfə təkrarən dedi:

— Ey kafir, ey kafir!..

Dərhal əmirli atlılarından birisi bir güllə atıb əsgərin birini öldürdü. Bu zaman rus əsgərləri dərhal birlikdə onların üzərinə atəş açdılar. Güllələrin bir neçəsi İbrahim xana dəydi və kürsüdən yıxıldı. Xanın övrət-uşağı tökülüb onun bədənini qucaqlayıb ağlaşmağa başladılar. Atılan güllələrdən neçəsi onlara, əyanlara və nökərlərə dəydi. Qalanlar isə hərə bir şey götürüb, müxtəlif tərəflərə qaçdılar. Əmiraslan bəy dərhal mərhumə Gövhər ağanı və qızıl qəlyanı götürüb qaçdı. Məzlum xanın ev əhli və uşaqlarından salamat qalanlarını onun adamları götürüb qırğından xilas etdilər. Əmiraslan bəy isə Gövhər ağanı möhkəm və təhlükəsiz bir yerdə gizlədi. Sonra isə gəlib bir az yemək əldə edib, Gövhər ağaya gətirdi. Gövhər ağa gözü yaşlı istər-istəməz bir neçə loxma yedi. Əmiraslan bəy Gövhər ağanı birtəhər sakitləşdirib, sonra öz evinə gətirdi.

Digər tərəfdən İbrahim xan öldürüldükdən sonra onun atlı dəstələri də dağılıb hərəsi bir tərəfə getdi. Hadisə yerindən uzaqlaşan xan atlıları Nabatxan deyilən yerdə Əbülfət ağanın qoşununa rast gəldilər. Əbülfət ağa gördü ki, bir neçə atlı sürətlə hərəkət edirlər. O, nökərlərinə buyurdu ki, o atlıları qaytarıb, onun hüzuruna gətirsinlər. Atlılar İbrahim xanın başına gələn əhvalatı eşitcək hönkür-hönkür ağladıqdan sonra qoşunla ordan geri, İrana qayıtdı ki, şahdan yeni fərman sadir ola.

Xülasə, bu əhvalat ətraflı şəkildə «Tarixi-Qacariyyə»də və «Qarabağ tarixi»ndə şərh edilir. Oxumaq istəyənlər həmin tarix kitablarına müraciət edə bilərlər. Bizim məqsədimiz isə bu illərdə erməni tayfası ilə müsəlmanlar arasında baş vermiş əhvalatları (iğtişaş və qırğınları) bəyan etməkdir.

Elə ki rus dövləti Qafqaz məmləkətinə hakim oldu, hər yerdə sakitlik yarandı. Heç bir millətin bir-biri ilə işi yox idi. Hər kəs öz işi ilə məşğul idi və hər millət öz qanunu ilə məbədlərində ibadət edirdilər. Heç bir millət bir-birinə hücum etmirdi. Xüsusən, ermənilərlə müsəlmanlar arasında çox vaxt məhəbbət və dostluq olub, bir-biri ilə alış-veriş edirdilər. Xanlıqlar zamanında ermənilər və müsəlmanlar arasında belə mehribançılıq var idi. Hətta İbrahim xan erməni məliklərindən Məlik Şahnəzərin qızı Hurizad xanımı özünə kəbinli arvad etmişdi. Həmin Hurizad xanımın Böyük məscidin həyətində hal-hazırda vaqviyyatı var.

Əfsuslar olsun ki, erməni tayfasının indi təbiəti dəyişib. Zahirləri batinləri ilə bir deyil. Zahirən özlərini dost kimi göstərsələr də, batinləri ədavətlidir. Özləri də görürlər ki, təbiətlərinin bu cür ədavətli olmasından həmişə zərər çəkirlər.

## BAĞIRQAN DAĞI

Bu halda bir neçə gəlmə erməni tayfasının törətdiyi əhvalatlardan yazmaq lazımdır. Əvvəla, mərhum İbrahim xanın hökmranlığı zamanında Pənahabad, yəni Şuşa qalasının şərq tərəfində Bağırqan dağı deyilən yerdə bir uca qaya vardı. Həmin dağda öz təbəələri ilə Avan Koxa adlı bir erməni yaşayırdı. Avan Koxa öz təbəələrinə buyurmuşdu ki, harda əllərinə müsəlman düşsə, tutub onun hüzuruna gətirsinlər. Avan Koxanın əmrilə tutulmuş müsəlmanı çılpaqlayıb üzü üstə yerə yıxardılar. Sonra onun arxasının dərisindən dörd barmaq enində bıçaqla boynundan qom ətinəcən iki tərəfdən xətt çəkdirər və dərinin ucunu aşağı əydirilmiş ağacın qüvvətli bir budağına bənd edib budağı buraxırdılar. Ağacın budağı qüvvətlə yuxarı qalxanda o yazıq müsəlmanın dərisi boynuna qədər soyulardı və onun bağırtısı o dağa düşərdi. Bu əhvalatı görənin və eşidənin də bağrı qan olardı. Buna görə də həmin qayaya «Bağrıqan dağı» adı vermişdilər.

## QƏDİMDƏ ERMƏNİ—MÜSƏLMAN DAVASI

1260-ci (miladi 1844) il tarixdə qundaqsaz İsaballı adlı bir erməni başqa ermənilərlə birlikdə müsəlmanların şəbeh gətirməyini təqlid edərək istehza edərlərmiş. Müsəlmanlar hadisədən xəbərdar olan saat dükan-bazarı bağlayıb Xan bağına getdilər və şəhərin hakimi Cəfərqulu xanı Qalaya gətirdilər. Şəhərdə böyük bir qovğa üz verdi. Böyük-kiçik hamı hakim tərəfə üz qoydular. Bu haldan çox qorxuya düşmüş hakim nə qədər istədi ki, müsəlmanları sakitləşdirsin, mümkün olmadı. Axır, bir bəhanə ilə aradan çıxıb evinə getdi. İğtişaş get-gedə şiddətlənirdi. Onun qarşısını almaq üçün Şuşakənddə olan digər şəhər hakimi Ala bəyi gətirdilər. Ala bəy atlı meydana daxil olan kimi xalq onu araya aldı. Mirhadi adlı bir seyid irəli gəlib Ala bəyi çəkib atdan yerə saldı və vurub baş-gözünü yardı. Xalq üz qoydu ermənilərin üstünə. Ermənilər tamam dükandan çıxıb qaçdılar. Kimisi dükanı bağladı, kimisi bir qapısını örtdü, kimisi də buna fürsət tapmayıb ayaqyalın üz qoydular qaçmağa. Bir para uzaqgörən müsəlmanlar qaçan ermənilərin bir parasını evlərinə gətirib, mühafizə edib sakitləşdirdilər. Cahil müsəlmanlar isə ermənilərin vurub baş-gözlərini yardılar. Xülasə, şəhərin hakimi birtəhər müsəlmanları sakit edib erməniləri böyük fəlakətdən qurtardı.

***

Hicri 1294-cü (miladi 1877) ildə rus-osmanlı müharibəsində rus dövlətinin ordu başçılarından bir neçəsi erməni tayfasından idi. Həmin ermənilər Qars şəhərini tutarkən düşmənçiliklə nə qədər müsəlman kitabları və Qur'anı-Şərif əllərinə keçirdisə, yandırırdılar.

***

Həmin tarixdə ermənilərin böyük sənətkarları İrəvan şəhərində Üçkilsədə (Eçmiədzin) maşın tərtib edib, 9 milyon qəlp eskinas pul kəsdilər. Dövlət xəbərdar olub, qəflətən tökülüb həmin pulu və maşını müsadirə edib, pulkəsənləri və kəsdirənləri tutub cəzalandırdı.

***

Hicri 1321-ci (miladi 1903) il tarixində müsəlman kəndindən olan Məhəmməd və Salman adlı iki qardaş öz yüzbaşılarına etiraz əlaməti olaraq qaçıb meşənin içində kömür yandıran Aleksan adlı dağlı bir erməninin yanına gəldilər. Həmin iki qardaş erməni ilə hal-əhval etdikdən sonra əyləşdilər. Hava soyuq olduğuna görə bir az quyunun kənarında oturub qızındıqdan sonra xurcunlarında

olan yeməyin hamısını çıxarıb, yarısını ermənəiyə verdilər, qalanını isə özləri yedilər.

Əhvalatdan xəbər tutan bu iki cavanın ata-anası hər gün yemək və çörək gətirib həmin kömürxanada onlara verirdilər. Bu əhvalat bir neçə gün belə davam etdi. Yenə bir gün onlara dadlı yeməklər gətirdilər. Cavanlar yeməyi yarıya bölüb, yarısını erməniyə verib, yarısını özləri yeyib, isti vura-vura yuxuya getdilər. O məlun erməni özündən savayı, qabaqcadan daha iki erməni gətirib orda gizlətmişdi. Elə ki cavanlar yatdı, ermənilərin hər üçü durub əllərində balta yavaş-yavaş gəlib, o biçarələrin başlarını iki parə etdilər. Cavanlar bircə dəfə çığırıb canlarını tapşırdılar. Sonra o məlun ermənilər o biçarələri üryan edib, paltarlarını və ciblərini soyub, bədənlərini kömür quyusuna atıb yandırdılar.

Yenə bu günlərdə Əfətli kəndinin müsəlmanlarından iki nəfər şəxsi Ballıca kəndinin erməniləri hiylə ilə tutub öldürmüş və meyidlərini yandırmışlar.

***

Hicri 1321-ci il (miladi 1903) tarixdə rus-yapon müharibəsi zamanı bir qarabağlı erməni yapon dövlətinə dəyəri bir milyon yarım manat olan bir gəmi peşkəş elədi.

Bu zaman rus dövlətinin başı müharibəyə qarışdığına görə ermənilərdən çağırılmış əsgərlər dövlətə xəyanət edərək dəstə-dəstə silahları ilə bərabər, Osmanlı və İran dövlətlərinə qaçdılar. Qərəz, öz məzhəblərinin qaydası ilə andlarına yalan çıxıb müxtəlif xəyanətlər edirdilər.

***

Bunlar hər şəhərdə bir qımdatxana təşkil edirdilər. İlk dəfə Osmanlı şəhərlərində, sonra isə Rusiyanın ayrı-ayrı şəhərlərində belə qımdatxanalar yaratmağa başladılar. Bu qımdatxanalara bütün siniflərdən şəxs cəlb olunurdu: oxumuş cavanlar, sövdəgərlər, sənətkar və başqaları.

Bu qımdatların icmasının müşavirəsində bir qərar qəbul olundu ki, hər bir iş sahibi qımdatxanalara pul verməlidir. Qımdatxanadan həmin qərara əsasən erməni iş sahiblərinə məktublar göndərib onların qımdatxanaya göstərilən məbləğdə pul göndərməsini tələb edirdilər. Erməni iş sahibi məktubun tələbinə əməl etmədikdə ona qımdatxanadan ikinci dəfə elannamə yazılırdı. Əgər yenə həmin şəxs pul verməkdən imtina edərdisə, üçüncü dəfə onu hədələyirdilər. Bu dəfə də tələbə əməl etmədikdə qımdatlar həmin şəxsin öldürülməsi üçün bir və ya iki nəfər təyin edirdilər. Həmin şəxslər isə nəzərdə tutulmuş adamı öldürüb gizlənirdilər. Heç kəs bilmirdi ki, bu cinayəti kim etdi və hara getdi. Əgər caniləri bilən və tanıyan olsa da, cürət edib heç kəsə deyə bilməzdi. Çünki kimsə canini ifşa etməyə cəhd göstərsəydi, onun özü də qımdatxana quldurlarının sui-qəsdinə məruz qalardı.

Atası nalbənd olmuş Camqarov familiyalı bir erməni Allah təbarək və təalanın iradəsilə tez bir zamanda milyonçu olur. Qımdatlar başqa varlı ermənilər kimi ona da kağızla müraciət edib qımdatxanaya 30 min manat verməsini tələb edirlər. O isə qımdatların tələbinə məhəl qoymayıb Moskvaya gedir. Bu zaman qımdatlar Moskvada yerləşən qımdatxanaya yazırlar ki, o bizim tələbimizə əməl etmədiyinə görə cəzasına çatdırılaraq qətlə yetirilsin.

Moskva qımdatxanasının başçıları özlərinin muzdlu qatillərinin arasında püşk ataraq Camqarovun öldürülməsi tapşırığını onlardan birinə həvalət etdilər. Həmin qatil Camqarovu Moskvada kilsənin qapısı yaxınlığında qətlə yetirdi.

Beləliklə də, qımdatxanaların muzdlu qatilləri neçə-neçə günahsız ermənilərin və rusların ölümünə də bais olurdular.

Əlavə:[2] Hicri 1321-ci (miladi 1903) ildə rus dövləti Qafqaz vilayətindəki kilsələrin əmlakını zəbt etmək istəyirdi. O vaxt bütün Qafqaz şəhərlərində olan erməni icmalarının başçıları toplaşıb rus dövlətinin niyyətinə qarşı durmaq və onun həyata keçirilməsinə mane olmaq qərarına gəldilər. Bunun nəticəsində dövlət tərəfindən erməni milliyyətindən olan xeyli adamlar qətlə yetirildi. Bununla bərabər, bir çox erməni icmalarının tanınmış başçıları tutularaq Sibirə göndərildi. Kilsələrin əmlakı isə zəbt olunub dövlət sərəncamına verildi.

**ƏLAVƏ:** Həmin göstərilən bu ildə şəhərlərdə çox nahaq qanlar töküldü, xalqlar bir-birinə çox zülmlər etdilər. Bunun xoşagəlməz təsiri hər tərəfi bürüdükcə insanları xoş və rahat həyatdan məhrum edirdi.

Xüsusən, Mancuriya torpağında rus tayfasından nə qədər insanların nahaq qanları töküldü, gəmiləri dənizlərdə batırılıb məhv oldular, neçə-neçə şəhərlər və kəndlər xarabalıqlara çevrildi.

Bu tarixdə İran vilayətinə xəstəlik düşüb, sayı həddi-hesaba gəlməyən insanlar tələf oldular.

Bu günlərdə bəndeyi-aciz Nəvvab Mir Möhsün qardaşı Hacı Mirzə Abutalıb xanı Tehranda Amas adlı öz nökəri yatdığı yerdə öldürüb, bacardığı qədər cəvahiratdan və nəqd puldan götürüb qaçıb. Amma bu cinayətdən qaça bilməyib, rus divanxanasının əlinə keçib.

ƏLAVƏ: Hicri 1322-ci (miladi 1904) il tarixdə, iyunun 16-da Moskva şəhərinə bir dolu yağdı ki, dolunun hər bir dənəsinin ağırlığı təxminən bir girvənkəyə yaxın idi.

**Ə L A V Ə:** 1904-cü il iyulun 3-də rus padşahının oğlu oldu. Onun adını Aleksey qoydular.

[2] Mətndə əlavələr haşiyə kimi göstərilir.

## 1904-cü İLDƏ BAKIDA ERMƏNİLƏRLƏ MÜSƏLMANLAR ARASINDA BAŞ VERMİŞ MÜNAQİŞƏ

Əvvəla bunu bilmək lazımdır ki, İrəvan şəhərinin erməniləri çox kinli, ədavətli, təkəbbürlü, xudpəsənd və xəmirləri fitnə-fəsad ilə yoğrulmuş adamlardır. Hansı vilayətdə ki bunlar tapılır, mütləq orda bir ədavət və iğtişaş olacaq. Qafqaz vilayətlərində nə qədər iğtişaş və münaqişələr baş verirdisə, onların birinci səbəbkarı İrəvan erməniləri olurdu.

Bir gün Bakıda olan İrəvan erməniləri şəhərdə iğtişaş salmağa cəhd göstərirlər. Belə ki, özünü hamıdan qoçaq və igid hesab edən həmin ermənilərdən biri bir müsəlman öldürür. Ondan sonra lovğalanaraq hər yerdə özünü tərifləyir və gördüyü cinayətlə fəxr edirdi. Bir gün o, küçədə getdiyi yerdə 18 yaşlı Bakı camaatından gənc bir oğlan onun qarşısına çıxıb deyir:

— O erməni qoçağı sənsən?

Erməni cavab verir:

— Qoduq, mənəm!

Oğlan bu cavabı eşidən kimi tapançanı çıxarıb, ermənininin bədəninə üç güllə yeridərək öldürür. Ermənilər həmin müsəlman oğlanı tutub, döyə-döyə gətirib divanxanaya verirlər. Divanxanada oğlanın üstünü yoxladıqdan və dəfələrlə danışdırdıqdan sonra zindana göndərirlər. Ermənilər divanxanada həmin oğlanı danışdıran məmura rüşvət verib, razı saldıqdan sonra onu bir də divanxanaya gətirilib sorğu-sual edilməsini tələb etdilər. Onlar məmurun qarşısında belə şərt qoydular ki, oğlanı məmurun yanına erməni əsgərləri gətirsin. Elə ki oğlanı məmurun yanına gətirdilər, dedi ki, mən bütün həqiqətləri açıb danışmışam. Sən isə bunların hamısını yazdın. İkinci dəfə buraya məni gətirməyə nə ehtiyac vardı? Məmur hirslənərək oğlanın boynuna yumruq vurub əmr etdi ki, onu həbsxanaya aparsınlar. Oğlan məmura yalvarıb xahiş etdi ki, onu erməni əsgərləri ilə göndərməsin. Çünki onlar yolda məni öldürəcəklər. Məmur ona qulaq asmayıb, zindana aparmağı əmr etdi. Həmin İrəvandan olan erməni əsgərlər isə oğlanı çəkə-çəkə aparıb, bir dar küçədə yerə yıxdılar və süngü ilə dəlik-deşik edib öldürdülər. Sonra isə məmura bildirdilər ki, qaçmaq istəyirdi, biz də öldürdük.

**Əlavə:** Karxana sahibi olan sabunçulu Ağa Rəzi adlı böyük bir şəxs faytonda küçə ilə gedərkən ermənilərin hücumuna məruz qalaraq öldürülmüşdü. Əhvalatdan xəbərdar olan Bakı əhli bundan çox təsirləndilər. Bundan əvvəl də ermənilər tərəfindən bir sıra cinayətlər törəndiyinə görə xalq arasında böyük iğtişaş baş verdi. Ermənilərin bu düşmənçiliyinə artıq dözməyən camaat bazar-dükanları bağlayaraq cavanlar tüfəng-tapança ilə silahlanıb, üz qoydular erməni camaatının üstünə. Dükanda ələ düşəni dükanda, bazardakını bazarda, küçədəkini küçədə öldürüb, leş-leş üstünə tökdülər.

## LALAYEVİN BAKI ŞƏHƏRİNDƏ TÖRƏTDİYİ ƏHVALAT

Bakı şəhərində erməni milliyyətinə mənsub olan Lalayev soyadlı bir nəfər vardı, karxana sahibi idi. Bu erməni var-dövlətinin çoxluğundan özünü hədsiz dərəcədə qudurğan aparırdı. Belə ki, ermənilərin məclisində və ya yığıncaqlarında müsəlman tayfasının adı çəkiləndə o, ermənilərə müraciətlə deyirdi ki, «sizə ar olsun, müsəlmanın adı gələndə titrəyirsiniz, müsəlmanlar kimdir ki, onlardan belə qorxursunuz? Mən müsəlmanları bir milçək və qarışqa hesab edirəm. Onlar od olsalar da özlərini yandıra bilməzlər».

Sabunçulu Ağa Rəzi öldürüldükdən sonra Bakıda baş verən iğtişaş zamanı hər tərəfi tüfəng və tapança gurultusu və müsəlman igidlərinin nərəsi və «ya Əli» sədası bürüyərkən həmin Lalayev qabaqcadan evində topladığı döyüş silahlarını işə saldı. Onun yaratmış olduğu 20-30 nəfərdən ibarət erməni quldur dəstəsini silahlandıraraq müsəlmanları qırmaq üçün onlara tərəf yönəltdi. Lalayevin əmri ilə evinin ətrafında olan bütün qapı-darvazalar bağlandıqdan sonra həmin quldur dəstəsinin üzvləri evin pəncərə, qapı və bacaları arxasında mövqe tutaraq, küçədən gəlib-keçən müsəlmanları atəşə tutdular. Bunun nəticəsində gəliş-gediş dayandı. Həmin gün bizim qarabağlı Tağı bəy Şirin bəy oğlunu qardaşı uşaqları evlərinə qonaq çağırmışdılar. Tağı bəy Şirin bəy oğlu faytonla həmin küçədən keçərkən Lalayevin evindən həmin quldurlar tərəfindən atəşə tutularaq öldürülmüş, faytonçu isə bir neçə yerindən ağır yaralanmışdı. Bu vaxt Bakı əhalisi arasında böyük şöhrət tapmış Ağakərim adlı bir nəfər mərd və igid oğlan öz silahlı dəstəsi ilə Bakının küçələrində cövlan edərək azərbaycanlıların həyatına qəsd edən erməni quldurlarını cəhənnəmə vasil edirdi. Nəhayət, onlar gəlib Lalayevin evi yerləşən küçəyə çatdılar. Ağakərim öz dəstəsini iki yerə bölüb birinə divarlar arxasından Lalayevin evini gülləyə tutmasını əmr edir, digər hissəsinə isə külüng-balta və lomla evin darvazasını açmaq əmrini verdi. Üçüncü dəstə güllə yağışının altında divarların dibi ilə Lalayevin evinin darvazasına yaxınlaşıb, lom və külünglə darvazanı dağıtmağa başladılar. Onlar əllərindəki alətlərlə darvazanı parça-parça edib yerə saldılar. Ağakərim və onun dəstəsi qəzəblənmiş aslan kimi «ya Əli!» sədası altında hücum çəkib içəri doldular. Camaat tüfənglərin gurultusundan və igidlərin nərəsindən dəhşətə gəldi. Lalayevin evində olan quldurlar karıxıb mat qaldılar. Onlar tüfənglərini atıb qaçmaq istəyərkən Ağakərimin dəstəsi onları bir-bir qətlə yetirdi və evdə gizlənənləri də çıxarıb, cəzalarına çatdırdılar. Bundan sonra Ağakərim bir neçə nəfərlə Lalayevin otağına daxil oldu. Ağakərim irəli gəlib dedi:

— Allah saxlasın, keyfin neçədir? O müsəlmanları ki, sən milçək və qarışqa hesab edirdin, indi onların hər biri şiri-nərə dönüb qulluğuna gəliblər.

Lalayev söyüd ağacının yarpağı kimi tir-tir titrəyərək dedi:

— Qələt eləmişəm, məni bağışlayın. Bu gün bəxşiş günüdür, öz zəhmətinizin əvəzində nə qədər pul lazımdır, götürün. Sandıqda kupon kağızları var. Götürün, aparın, xəzinə və bankdan pul alın. Uşaqların arasında bölün.

Ağakərim dedi ki, biz buraya puldan ötrü gəlməmişik. Bu millət davasıdır. Milləti müdafiə etməkdən ötrü biz can qoymuşuq və bu məqsədlə də buraya gəlmişik. Millət yolunda biz pula satılanlardan deyilik.

Bu vaxt Lalayevin övrəti gəlib özünü ərinin üstünə saldı və ağlaya-ağlaya Ağakərimə minnət elədi ki, siz gəlin bunu öldürməyin. Sizə nə qədər pul lazımdır, durum gətirim. Ağakərim övrətə dedi ki, bizə pul lazım deyil. Sənin bu kişin gərək öldürülə. Sənin kişin çox qürrələnib erməni məclislərində deyirmiş ki, müsəlmanlar mənim yanımda bir milçəkdir. Yarım milyon pul qoyub, onların hamısını məhv edərəm.

**Ə L A V Ə:** Belə deyirlər ki, bu halətdə Lalayev Hacı Zeynalabdin Tağıyevin yanına bir adam göndərib, özünün xilas edilməsini xahiş eləyir. Hacı buyurur ki, bu, mənə dəxli olmayan işdir. Baş verən hadisə isə millət məsələsidir, mən nə deyə bilərəm?

Xülasə, Ağakərim nə qədər çalışdı ki, övrət Lalayevdən aralansın, mümkün olmadı. Qəflətən camaatın içərisindən naməlum bir şəxs övrəti güllə ilə vurub öldürdü. Ağakərim onu məzəmmət etdi. Sonra isə Lalayevə bir neçə güllə vurub öldürdü.

Lalayev qətlə yetirildikdən sonra hamı evdən bayıra çıxdı. Evin hər yanından üstünə neft çiləyib, od vurdular. Ev böyük partlayışlarla yanmağa başladı. Bu da onu göstərdi ki, Lalayevin evinin zirzəmiləri yeşik-yeşik hərbi sursat və partlayıcı maddələrlə dolu imiş. Evdən qalxan gurultunun və partlayışın səsindən yaxında olan adamlar qulaqlarını tutaraq hərə bir tərəfə qaçırdı. Ev sursatlarla birlikdə yanıb külə döndü. Deyilənə görə, bir ay sərasər evdən tüstü kəsilmədi.

Belə deyirlər ki, Lalayevin xoşsifət gözəl bir qızı varmış. Həmin qıza heç kəs toxunmayıb, mehribanlıq göstərib və gətirib Hacı Zeynalabdinin qızlar məktəbində yaxşı əmin adamlara tapşırıblar.

**Ə L A V Ə:** Bakıda qırğın daha da şiddətlənərkən erməni tayfasından silahlı bir dəstə şəhərin küçələrində dolaşaraq hambalları və əlsiz-ayaqsız qocaları tutub öldürürdü. Həmin vaxt Bakının din xadimlərindən birisi öz qonşularında olan övrət və uşaqları, eləcə də qocaları öz evinə cəm edib, darvazanı bağlamışdı. Bundan xəbər tutan erməni dəstəsi mollanın evinin yanına çatarkən belə qərara gəldilər ki, Lalayevin əvəzini çıxmaq üçün bu mollanın evindəki övrət və uşaqları öldürüb, evinə od vurub yandırsınlar. Bu əzm ilə evin darvazasını sındırıb içəri girmək istəyərkən, o biri tərəfdən ləzgi tayfasından bir dəstə onların üstünə gəldi. Onlar erməniləri öldürüb, mollanın evində olan övrət-uşaqları erməni şərindən xilas etdilər. Ondan sonra ləzgilər xəncərlərini erməni qanından pak edib üz tutdular göy səmtinə və ərz elədilər ki, «Ya Məhəmməd, atamız-anamız sənə fəda

olsun, sənin dininin düşmənlərini məhv edib, cəhənnəmə vasil etdik. Bizdən razı oldunmu?» Xülasə, həmin müdafiə günündə ləzgi tayfasının Bakı müsəlmanlarına köməyi çox oldu. Həmin gün onlardan beş nəfər şəhid oldu.

## ERMƏNİLƏRİN BAKI QUBERNATORUNU ÖLDÜRMƏSİ

Bakıda baş verən bu qırğından bir az sonra şəhər qubernatoru faytonda küçə ilə gedərkən bir neçə nəfər erməni faytonun üzərinə hücuma keçərək bomba atıb partlatmışlar. Bombalar faytonun yanında yerə dəyib partlayaraq faytonu darmadağın etmişdir. Partlayışdan ağır yaralar alan qubernator və atlar ordaca ölmüşdür.

Quldur ermənilərin biri tutulmuş, digərləri isə qaçıb gizlənmişlər. Sonra aparılan axtarış nəticəsində bu cinayətdə iştirak edən daha dörd erməni həbsə alınmışdır.

Deyilənə görə, həmin beş nəfər cani erməni dar ağacından asılaraq cəzalarına çatmışlar.

Bu əhvalatdan sonra bir müddət sakitlik oldu. Lakin ayrı-ayrı erməni fitnəkarları öz fitnə-fəsadından əl çəkməyərək, gizli əllərinə düşən müsəlmanları öldürürdülər. Bu növ ədavətlər və xəyanətlər ara-sıra hər iki tərəfdən baş verirdi.

## 1905-ci İLDƏ İRƏVAN ŞƏHƏRİNDƏ BAŞ VERƏN ERMƏNİ—MÜSƏLMAN ƏHVALATI

Hansı vilayətdə ki, İrəvan ermənilərindən bir neçə nəfər tapılırdı, mütləq orda bir iğtişaş baş verirdi. Bu İrəvan erməniləri çox xudpəsənd, kinli və cinayətkardılar.

İrəvan şəhərinin müsəlmanlar yaşayan 80 evdən ibarət məhəlləsinin ermənilərlə iğtişaşı baş verib. Bu iğtişaşın başlanmasına səbəb olan ermənilər həmin məhəllədə müsəlmanların imarətlərini gülləbaran etməyə başladılar. Ermənilərə nisbətən müsəlmanların bu məhəllədə az olmasına baxmayaraq, ermənilərə qarşı müqavimətdə mətanətlə dayandılar və onlara böyük zərbələr endirdilər. İki tərəfdən üç gecə-gündüz davam edən güllə yağışının altında qırx nəfər erməni, iki nəfər isə müsəlmanlardan öldürüldü. Üç gündən sonra güllələri tükəndiyinə görə gecə vaxtı müsəlmanlar həmin məhəllədən qaçmalı oldular. Əhvalatdan xəbərdar olan ermənilər müsəlmanların evlərinə doluşub, onların mal-dövlətini qarət etməyə başladılar. Fürsət tapıb qaça bilməyən beş nəfər övrət və üç nəfər uşaq bir evin küncünə qısılaraq qorxudan titrəyə-titrəyə ağlayırdılar. Əllərinə düşən kitablara və Qur'ani-Kərimə od vurub yandırdılar. Ermənilərin qoca qadın və kişilərə, eləcə də uşaqlara etdikləri zülmü qələmə almaq çox çətindir.

İrəvanda ermənilərin müsəlmanlara qarşı törətdiyi qəddarlıqları və əzazilliyini şəhərin ətraf kəndlərində yaşayan müsəlman kürd tayfaları eşidən kimi

silahlanaraq atlara minib, qəzəblənmiş aslan kimi nərə çəkə-çəkə üz qoydular İrəvanda qırğın olan yerlərə. Yollarda əllərinə düşən erməniləri öldürüb, mallarını talan edib, evlərinə od vurub yandırırdılar. Ermənilərin qaçanları gəlib bir böyük kənddə cəm olmuşdular. Həmin kənddə dövlətin divanxanası və bir az qoşunu var idi. Həmin qoşun erməni—müsəlman arasında gedən qırğını dayandırmaq üçün kürdlərə mane oldular. Qafqaz canişininin göstərişi ilə cənab Şeyxülislam həzrətləri katolikos Hayrik ilə gəlib məsciddə və kilsədə dualar və xütbələr oxuyub, xalqa nəsihətlər verdilər. Bununla da iki xalq arasında gedən qırğınları dayandırdılar.

Bu əhvalatdan sonra erməni qımdatları başqa şəhər və kəndlərə dağılaraq yerli erməni əhalisini müsəlmanlara qarşı davaya qaldırmaq üçün onlar arasında təbliğat aparmağa başladılar. Uzaqgörən və davaya qoşulmaq istəməyən ermənilər qımdatların bu fitnə-fəsadlarından uzaq olmağa çalışırdılar. Qımdatlar isə belə erməniləri fürsət düşən kimi tutub öldürürdülər.

Həmin bu tarixdə, yəni 1905-ci ildə Tehran və onun ətrafında, eləcə də, Xorasanda vəba xəstəliyi yayılmışdı. İki ay davam edən bu xəstəlik nəticəsində hər gün təqribən yüz adam ölürdü.

## 1905-ci İLDƏ NAXÇIVANDA BAŞ VERMİŞ ERMƏNİ—MÜSƏLMAN ƏHVALATI

Elə ki İrəvanın fitnə-fəsad törədən erməniləri Naxçıvana gəldilər, orda vəziyyət gərginləşdi. Naxçıvan erməniləri neçə illərdən bəri tədarük etdikləri vuruş sursatlarını—topları, bombaları, beşaçılan tüfəngləri və s. növbəti qırğın üçün hazırlamağa başladılar. Hərbi sursatları keçidlərdə və gizli mövqelərdə yerləşdirdikdən sonra dükan-bazarları bağlayıb, bütün icma ilə qalxıb mövqelərdə hazırladıqları silahdan qəflətən müsəlmanlar üzərinə gurhagur atəş açmağa başladılar. Əhvalatdan xəbərsiz və dükan-bazarda öz işləri ilə məşğul olan biçarə müsəlmanlar çaş-baş qalıb, bilmədilər nə etsinlər. Kimisi fürsət tapıb dükanı bağladı, kimisi tapa bilməyib, açıq qoyub canını qurtarmaq üçün evlərinə qaçdılar. Yarım saata tüfəngi olan tüfəngini, tapançası olan tapançasını, olmayanlar isə xəncər, külüng, balta, dəhrə və ağac götürüb, ermənilərin müqabilinə gəldilər və onlarla davaya başladılar. Silahsız müsəlmanlar münasib fürsətlərdən istifadə edərək qəflətən erməni silahlılarının üzərinə hücum edib əllərindəki balta, dəhrə, ağacla vurub onları yerə yıxaraq tüfəng və patrondaşlarını əllərindən alıb, üz qoydular davaya. Müsəlmanlara kömək gələnə kimi hər iki tərəfdən ölənlər oldu. Bir para yerlərdən gələn müsəlmanlar nərə çəkərək üz qoydular ermənilərin üstünə. Hər tərəfdə ermənilər böyük tələfatə məruz qaldılar və vəziyyəti belə görüb üz qoydular qaçmağa.

Şəhər erməniləri məğlub olandan sonra müsəlmanlar üz qoydular erməni kəndlərinə. Həmin kəndlərdə ələ düşən erməniləri öldürüb, mal-dövlətini talan və

qarət etməklə bərabər evlərinə od vurub yandırdılar. Bu kəndləri darmadağın etdikdən sonra üz qoydular Naxçıvan qəzasındakı Böyük Badamlı kəndinə. Həmin kəndin bütün erməniləri—gənc və qoca, böyük və kiçik öz külfətləri ilə müsəlmanların qarşısına çıxdılar. Tam ehtiramla kəlmeyi-şəhadəti deyib müsəlmanlığı qəbul etdiklərini bildirdilər. Müsəlmanlar onları çox sevinclə sakitləşdirib, böyük ehtiramla oradan geri qayıtdılar. Bu xəbər hər tərəfə yayıldı. Erməni qəzetləri yazırdı ki, müsəlmanlar bu qədər qətl və qarətlə kifayətlənməyib, erməniləri məcburi şəkildə öz dinlərindən döndərib müsəlman edirlər.

Bu əhvalat dövlətə və divan əhlinə çatan kimi hökm elədilər ki, durmadan İrəvan qubernatoru həmin kəndə getməlidir. İrəvan qubernatoru Əlixanov çoxlu kazak götürüb, qoşunla Badamlı kəndinə gəldi. Əlixanovun görüşünə gəlmiş müsəlman dinini qəbul edən ermənilər onu salamlayarkən Əlixanov onların salamını rədd edərək buyurdu ki, erməni qəzetlərinin yazdığına görə müsəlmanlar sizləri zor və hədə-qorxu ilə öz dininizdən döndərərək, müsəlman ediblər. Əgər həqiqət belədirsə, kazak qoşunu burada qalıb, sizi qorumağa hazırdır. Sizə qarşı heç kəs qüvvə işlədə bilməz. Yeni islam dinini qəbul etmiş ermənilər cavab verdilər ki, bizi heç kəs zor və hədə-qorxu ilə müsəlman etməyib. Əksinə, biz özümüz könüllü olaraq, öz razılığımız və rəğbətimizlə islam dinini qəbul etmişik. Bu cavabı eşidən Əlixanov camaata heç bir söz demədən geri qayıdıb getdi.

## 1905-ci İL TƏBRİZ ƏHLİNİN ƏHVALATI

Naxçıvanda, İrəvanda və Bakıda baş verən iğtişaşlar zamanı İran təbəələrindən olan müsəlman camaatından da məzlum və şəhid olduğunu eşidən Təbriz əhli buna dözməyib qəzəblənir, bazar-dükanı bağlayıb üz qoyurlar erməni məhəllələrinə tərəf. Onlar yuxarıda göstərilən şəhərlərdə nahaq yerə öldürülmüş müsəlmanların qanının əvəzini çıxmaq üçün ermənilərin üstünə gedirdilər. Əhvalatdan xəbərdar olan ermənilər dəhşətə gələrək böyük-kiçik, övrət-uşaq qapıları bağlayaraq dad-fəryad qoparırlar və əhvalatı Təbriz hakiminə çatdırırlar. O isə erməniləri mühafizə etmək üçün erməni-müsəlman məhəllələrinin arasına qoşun yeridir. Qoşun dəstələri tüfənglərini çəkib atəşə hazır vəziyyətdə dayanırlar. Bununla da Təbriz hakimi ermənilərin öldürülməsinin və evlərinin qarət edilməsinin qarşısını aldı. Bir neçə gün ərzində Təbrizdə sakitlik yaradıldı. Bundan sonra Təbriz hakiminin əmri ilə ermənilərdən bütün silah və sursatın (tüfəng, güllə, tapança və s.) hamısını yığdılar. Təbrizin erməni camaatı teleqraf və məktubla katolikosa və yerli din xadimlərinə müraciət etdilər ki, ermənilər sakit oturub ədavət törətməsinlər. Çünki əks təqdirdə biz burada müsəlman əhli tərəfindən qətlə yetirilə bilərik.

## XORASAN ƏHVALATI

**Ə L A V Ə:** Yenə bu tarixdə etibarsızlığı və nahaq yerə qan tökməyi və müsəlmanlara qarşı qəddarlığı ilə hamıya yaxşı məlum olan erməni tayfası bir para müsəlman əhlini guya ermənilərin özündən qorumaq və mühafizə etmək üçün onları şirin dilə tutub öz evlərində sığınacaq verirlər. Sonra isə onları qətlə yetirib, bədən üzvlərini kəsmiş, başlarına nal və mismar çaldıqları müsəlmanlara məlum olmuşdur. O cümlədən, Xorasan əhli də bu əhvalatdan xəbərdar olan kimi qəzəblənib, həmin saat töküldülər erməni dükanlarının üstünə. Nə qədər mal və əşyaları var idi talan və tarac etdikdən sonra özlərini də qətlə yetirmək istəyərkən bir para divan əhli tez bunun qarşısını alaraq ermənilərin qətlə yetirilməsinə imkan vermədilər.

**Ə L A V Ə:** 1905-ci ildə Tiflis şəhərində Qafqaz namestniki (canişini) öz övrəti ilə faytona minib küçələrin birindən keçdiyi zaman çoxdan fürsət axtaran erməni qımdatlarından 4 nəfər həmin faytonun üzərinə hücum çəkərək xəncər ilə namestniki bir neçə yerindən yaralayıb qaçdılar. Canişinin yanında olan kazak ermənin birini öldürdü, o biriləri isə qaçıb gizləndilər.

**Ə L A V Ə:** Yenə bu tarixdə divana qulluq edən bir ləzgi müsəlmanını rus xəzinəsinin qabağında ermənilər tapança ilə vurub öldürdülər. Əhvalatdan xəbərdar olan Şuşa qalasının müsəlmanları böyük bir icma ilə gedib həmin ləzginin cəsədini tabuta qoyub böyük məscidin həyətinə gətirirlər. Qüsl verdikdən sonra isə aparıb qəbiristanlıqda dəfn edirlər. Müsəlmanların qəzəbindən ehtiyat edən ermənilər acizanə surətdə müsəlmanlardan üzrxahlıq etdilər ki, həmin ləzgini rus bilib öldürüblər. Ona görə qatilin bağışlanmasını xahiş etdilər.

**Ə L A V Ə:** Yenə bu tarixdə Şuşa qalasında erməni cəmaatı rus tayfasından bir böyük vəzifəli şəxsi tapança ilə öldürdülər. Həmin bu rus ilk dəfə Qalaya gələndə kasıb olduğundan bir manata belə möhtac imiş. Amma öləndən sonra onun evindən külli miqdarda nəqd pul və əşya çıxmışdır. Buradan aydın oldu ki, o, dövlətə xəyanət edib erməni və müsəlmanlardan rüşvət almışdı.

Xülasə, erməni tayfası bu qəbil şəxslərdən Qalada və kəndlərdə çox öldürürdülər.

Bütün bunlara baxmayaraq, müsəlmanlar onlara (ermənilərə) mehribanlıq və hörmət göstərirdilər. Belə ki, bu tarixdə Şahnəzərovlar nəslindən Qriqor ağa adlı birisi vəfat etmişdi.

Müsəlmanların əyan və əşrafları toplaşıb onun dəfn mərasimində iştirak etdilər. Qriqor ağanı tabuta qoyub müsəlmanlar öz qayda-qanunları ilə çiyinlərinə alaraq qəbiristanlığa aparıb dəfn etdilər. Onun özü və ata babaları (Bəhram bəy, Cəmşid bəy və Məlik Şahnəzər) müsəlmanlara çox böyük rəğbət bəslədiklərinə görə Qalanın müsəlman camaatı bir neçə gün yas mərasimində iştirak etdilər. Hətta Cəmşid bəyin bir bacısı Hurizad xanım mərhum İbrahim xanın arvadı idi. Bu xanımın övladı olmadığına görə böyük məscidin həyətində otaqlar tikdirərək vəqf

etdirdiyi otaqlar indi də qalmaqdadır. Cəmşid bəyin özü Rəhim bəyə vəsiyyət etmişdi ki, öləndə məni erməni qəbiristanlığında dəfn etməsinlər. Cəmşid bəy öləndə Rəhim bəy Şuşada olmadığından ermənilər onu aparıb öz qəbiristanlıqlarında dəfn etmişdilər. Rəhim bəy gələndən sonra dərhal Cəmşid bəyin tabutunu erməni qəbiristanlığından çıxarıb kənar yerdə dəfn etdilər.

## 1905-ci İL ŞUŞA ŞƏHƏRİNİN ƏHVALATI

Şuşa qalasında erməni tayfasının bir para nalayiq işlərinə görə müsəlmanlar dözmədiyindən hər iki tayfa arasında böyük bir iğtişaş baş verdi və az qaldı ki, qan su yerinə axsın. Hər iki tərəfdən xeyirxah məsləhətçilər odu yatırmağa çalışdılar. Bir neçə dəfə erməni xəlifəsi və keşişləri, eləcə də min nəfərə yaxın əyanlar və bazar əhli məscidə gəlib dualar və xütbələr oxudular. Bununla da müsəlmanlarla sülhü bərqərar eləyib şad və xürrəm geri qayıtdılar.

Neçə dəfə ermənilər tərəfindən bu növ qərəzli düşmənçilik hərəkətləri baş vermiş, lakin erməni xəlifəsi hər dəfə bir dəstə adamla qazinin evinə gələrək qan tökülməsinin qarşısını almışdır. Bu hal uzun çəkmədi. Bir gün müsəlman cavanlarından bir neçəsi bazara gəlib qəflətən qışqıraraq dedilər ki, ay müsəlmanlar, nə qafil oturmusunuz? Ermənilər tökülüb təzə məhəlləni tar-mar edirlər. Bazar əhli bu dəhşətli xəbəri eşidən kimi qəzəbləndi. Və həmin anda dükanları bağlayıb, bazar camaatının bir parası silahlarını götürüb Təzə məhəlləyə tərəf yüyürdülər. Bir parası isə tüfəng və tapançalarını doldurub bazarda olan ermənilərin üzərinə hücum çəkdilər. Ermənilər bu vəziyyətdən qorxuya düşüb kimisi dükanı bağlayıb qaçdı, kimisi isə dükanın içinə girib qapını daxildən bağlayıb gizləndi. Bəziləri isə qonşuluqda olan müsəlman evlərində gizlənib özlərini xilas etdilər. Bu iğtişaş başlayarkən Təzə məhəlləyə getmiş silahlı adamlar geri qayıdıb xəbər gətirdilər ki, deyilənlər yalandır. Odur ki, mollalar və seyidlər gəlib ermənilərə təskinlik verdi ki, bu iğtişaş səhvən olub. Bazar əhlinin tələbi ilə yalan danışmış adamı tutub çəkə-çəkə bazara gətirdilər. Onlar yığışıb söyə-söyə bu yazığı o qədər döydülər ki, az qaldı ölsün. Binəvanın başına o qədər vurmuşdular ki, beyni xarab olub dəli olmuşdu. Uzun müddət müalicə olunmadı. Sonra Tiflisə aparsalar da, orada müalicənin əhəmiyyəti olmamış, 1323 (1905)-cü ilin zilhiccə ayında vəfat etdi. Həmin adam hamamçılardan Kərbəlayı Abbasın oğlu Məşədi Qurban idi.

Bu günlərdə şəhərdə iki məşhur şəxs vəfat etmişdi. Bu xəbəri eşidən müsəlmanlar 3 günlüyə dükan-bazarı bağlayıb məscidi-camedə matəm saxladılar. Erməni xəlifəsi bu xəbəri eşidən kimi camaatı ilə məscidə gəlib başsağlığı verir və öz adətləri ilə İncildən dua oxuyub gedirdilər. Beləcə ermənilərlə müsəlmanlar alış-veriş edib bir müddət sakit dolanırdılar. Amma hər tərəfdən xəbər gəlirdi ki, erməni qımdatlarının arasında dava etmək xüsusunda böyük məsləhətləşmələr gedir. Onların, yəni qımdatların üçdə iki hissəsi müsəlmanlarla dava etməyi hələlik

məsləhət bilmirdilər. Qalan üçdə bir hissəsi isə müsəlmanlarla davanın zəruri olduğunu söyləyirdilər. Onların qarşısına qoyduğu məqsəd bütün müsəlmanların ev-eşiyini tar-mar etmək, özlərini qətlə yetirmək, Şuşa qalası kimi möhkəm bir şəhəri ələ keçirmək, ondan sonra isə tədarük etdikləri bütün silahla ruslara qarşı müharibə elan edib azadlığa nail olmaq idi. Bu arada bir nəfər gəlib müsəlmanlara xəbər verir ki, bir iranlı qərib seyid erməni ilə alış-veriş edəndə erməni ona nalayiq sözlər deyərək hörmətsizlik edib. Xalq bundan hiddətlənərək məscidin həyətinə toplaşır. Mən də məscidə gəlib həmin təhqir olunmuş seyidi görmək üçün onun dalınca bir adam göndərdim. Onu mənim yanıma gətirdilər. İçəridə və bayırda müsəlman camaatı qaynaşırdı.

Erməni məhəlləsinin hakimi Qasım bəy (müsəlman) bizim yanımıza gəldi. Vəziyyəti belə görüb həmin hakim Kiki (erməni) adlı Duma deputatına bir məktub yazır və qeyd edir ki, həmin müqəssir erməni bir qrup adamla gəlib həmin seyidlə barışsın ki, bu iğtişaşa son qoyulsun. Həmin Kiki müqəssiri 30 nəfərəcən sövdəgər ermənilərlə birlikdə bizim yanımıza gətirdilər. Levon adlı müqəssir gəlib seyidin əlini öpür, üzr istəyir və beləliklə də, camaat sakitləşir.

Belə tədbirlər nəticəsində hiddətlənmiş camaatı sakitləşdirmək mümkün olurdu. Odur ki, müsəlman və erməni böyükləri, eləcə də qazi və keşişlər bir din xadimi və iki nəfər mülki şəxsdən ibarət qruplar yaradıb kənd yerlərinə və bağlara göndərirdilər, əhaliyə nəsihətlər verib sakitləşdirsinlər. Bununla da iki millət arasında baş verə biləcək iğtişaşın, müvəqqəti də olsa, qarşısını alırdılar. Bir neçə vaxt bu iki xalq arasında sakitlik yarandı. Buna baxmayaraq, ermənilər öz fitnə-fəsadlarından əl çəkmirdilər. Sadəlövh müsəlmanlar isə onların bu hiylələrinə inanıb heç bir tədbir görmürdülər. Amma bu hiyləgər tayfa gizlincə tədarük görüb yollar üzərində, gizli yerlərdə və hündür qayalarda səngərlər yaradırdılar. Onlar müsəlmanlarda olan silahları ələ keçirmək üçün belə bir hiylə işlətdilər. Əgər tüfəng bazarda 20 manata satılırdısa, onlar 100 manata, tapança 6 manata olduğu halda, 30 manata alırdılar. Sadədil müsəlmanlar silahların ermənilər tərəfindən belə baha qiymətə alındığını görüb evlərində nə qədər silah və sursat var idisə, tamamən ermənilərə satdılar.

Dövlətin başı yapon-rus müharibəsinə qarışdığına görə Qarabağda baş verən iğtişaşlara məhəl qoymurdular.

Dövlətin göstərişi ilə bu iki tayfa arasında sülh yaratmaq üçün və hər cür iğtişaşların qarşısını almaq üçün müsəlmanlar toplaşıb bir neçə nəfər tədbirli adam seçib bir məclisi-xeyriyyə yaratdılar.

Həmin seçilmiş şəxslər müsəlman camaatına xəbər etdi ki, erməni tayfası hiylə işlədərək müsəlmanlardan silahı toplamaq məqsədilə həmin silahları müsəlmanlardan olduqca baha qiymətə alırlar. Axırda həmin silahlarla müsəlmanların özlərini qətlə yetirəcəklər. Bundan sonra müsəlmanların ermənilərə silah və sursat satmağı qadağan edildi. Hər məhəlləyə xüsusi adamlar təyin edildi ki, hər kəsin erməni tayfasına silah satmasına imkan verməsin. Hər ailəyə tapşırıldı

ki, öz imkanı daxilində bir və ya iki tüfəng, tapança və patronlar alıb evində hazır saxlasınlar. Odur ki, müsəlmanlar satdıqları silahların əvəzinə, birə-beş satdıqlarından da baha qiymətə yeni sursatlar almaq məcburiyyəti qarşısında qaldılar. Bundan sonra müsəlmanlar ermənilərin hiylələrindən agah olub bir balaca ayıldılar. Evlərdə lazım olan ərzaq tədarükü də görməyə başladılar. Kənd yerlərində yaşayan camaatı da ermənilərin bu hiyləsindən xəbərdar etdilər və silah almalarını məsləhət gördülər.

Vəziyyəti belə görən ermənilər yavaş-yavaş müsəlman bazarlarından köçməyə başladılar. Lakin onların bir parası müxtəlif səbəblər gətirərək köçməsə də dükanlarında olan malların hamısını erməni məhəlləsinə köçürürdülər. Amma erməni məhəlləsindəki bazarda dükanları olan müsəlmanlara deyəndə ki, müsəlman məhəlləsinə köçün, onlar, «ermənilər bizim dostumuzdur, onlardan bizə və bizim malımıza heç bir xətər dəyə bilməz», — deyə cavab verdilər.

İrəlidə özlərinə dost hesab etdikləri bu tayfanın erməni məhəlləsindəki dükan sahiblərinin başlarına hansı müsibətləri gətirdiklərini yazacağıq.

Müsəlmanlarla dava etmək və qırğın salmaq fikrində olan qımdatlar bütün yığıncaqlarda erməniləri müsəlmanlara qarşı təhrik məqsədi ilə deyirdilər:

«Ah-ah, Bakıda Lalayevin qanı yerdə qaldı, İrəvanda filan qardaşımıza zülm oldu, Naxçıvanda bir o qədər qardaşlarımızı öldürdülər, filan qədər övrət və kişiləri müsəlman etdilər. Onsuz da əvvəl-axır hamımız öləcəyik. Odur ki, yaxşı olardı xalqımız yolunda ölək və qardaşlarımızın qanını alaq».

Onlar belə fitnə-fəsadlara təhrik etmək məqsədi güdən söhbətlərlə ermənilərin qulaqlarını doldurub hər gün müsəlmanlara qarşı bir fitnə törədirdilər.

Bu günlərdə padşahlıq postundan üç nəfər rus bir çamadanda padşahlıq xəzinəsinə qırx üç min manat nəqd pul nə qədər vegsel aparan zaman, divarın arxasından çıxan erməni qımdatları həmin rus xadimlərini öldürüb pulu çamadanla götürüb qaçmışlar. Bu məbləğdə böyük pul erməni qımdatlarının əlinə keçdikdən sonra onların müsəlmanlara qarşı düşmənçilikləri və fitnə-fəsadları daha da artmağa başladı, sonra öz aralarında müsəlmanlara qarşı bir hücum planı hazırladılar. Bu planda hücumun tarixi və vaxtı saatlara qədər hesablanmışdı. Plana əsasən Qalada olan müsəlmanların hamısı böyükdən kiçiyə qədər qırılmalı, malları talan edilməli, ev-eşikləri isə yandırılıb xarabaya döndərilməli idi. Bu məzmunda planı müzakirə etmək üçün bir erməni hakiminin yanına apardılar. Həmin şəxs planla tanış olduqdan sonra onlara dedi:

«Bu yazdığınız hünərlər sizdə vardırmı?»

Onlar cavab verdilər:

«Görərsən ki, dörd saat ərzində bütün müsəlmanları qırıb məhəllələrini tar-mar etdikdən və Qalanı ələ aldıqdan sonra rusların başına nə gətirəcəyik». Hakim buyurur ki, iddianız çox böyükdür, amma vaxtınız çox azdır. Qımdatlar söylədilər ki, səkkiz saat olmasın, on iki saat olsun. Axır ki, bu sutkada, yəni bir gecə-gündüz ərzində görəcəksən ki, 12 saatdan sonra müsəlmanların böyük məscidində nahar

edəcəyik, 24 saatdan sonra isə xan sarayı üzərində öz bayrağımızı qaldırıb, Qalanı tamamilə öz əlimizə alacağıq.

Həmin hakim buyurdu ki, bunu mənim ağlım kəsmir, sizin dediyiniz sözlər xəyal və mənasızdır.

Bu sözləri eşidən kimi qımdatlardan birisi təkəbbür və qəzəblə planı onun əlindən alıb yoldaşları ilə birlikdə öz evlərinə qayıtdılar.

Ermənilər öz tayfasını mənəvi baxımdan bu iğtişaşa hazırlamaqla, bütün küçələrdə və səngərlərdə hazırlıq görməklə bərabər, başladılar müsəlmanlara sataşmağa.

Bu işlərdən xəbərdar olan bir erməni övrəti deyir ki, bizim qımdatların bu tədbirdə böyük səhvləri var. Bundan ötrü ki, mən bir kasıb övrətəm, dörd uşağım var. Bir toyuğum neçə gündür azıb, orda-burda yumurtlayır. Artıq üç gündür ki, mən və dörd uşağım o bircə toyuğun öhdəsindən gəlib onu tuta bilmirik. Bir halda ki, beş nəfər bir toyuğun öhdəsindən gələ bilmir, bəs bizim bu qımdatlarımız bu qədər yığılmış erməni ilə milyon-milyon müsəlmanların öhdəsindən necə gələcək?

Xülasə, ermənilər öz fitnə-fəsadlarını davam etdirirdilər. Bir gün küçələrin çırağını yandıran Kərbəlayi Məmmədhüseyn adlı bir nəfər səhər tezdən çıraqları söndürərkən üç nəfər erməni Şahlıq körpüsünün yanında bu yazığı nərdivandan yerə salıb neçə yerindən doğradılar. Onun dad-fəryadını eşidənlər yüyürüb hadisə yerinə gəldilər. Kərbəlayi Məmmədhüseyn qan içində çapalayırdı, o hələ ölməmişdi. Ondan soruşanda ki, səni bu hala kim salıb. Dedi ki, üç erməni məni xəncərlə beləcə doğradı. Yazıq bu sözləri deyib öldü.

Bu əhvalat müsəlmanlara çox təsir etdi. Müsəlman komissiyaları dum divanına toplaşıb ermənilərdən o yazığın qanını istədilər.

Bu əhvalatdan sonra erməni qımdatları müsəlmanlara poçta ilə göndərilən bağlama və əmanətlərin içərisində silah və sursat olmasından ehtiyat edərək onları gizlincə yoxlayırlarmış.

## QARABAĞIN ŞUŞA ŞƏHƏRİ VƏ ƏTRAFINDA BAŞ VERƏN ERMƏNİ-MÜSƏLMAN İĞTİŞAŞLARI VƏ ERMƏNİLƏRİN MƏĞLUB OLMASI

Ermənilər öz qarşılarına qoyduğu məqsədə çatmaq üçün durmadan səngərlər tikir, müxtəlif tədarüklər görür, vilayətlərdən və kəndlərdən Şuşaya kömək gətirirdilər. Odur ki, şəhər erməni tayfası ilə dolmuşdu.

Mən, Mir Möhsün Nəvvab evim erməni məhəlləsinə qonşu olduğuna görə qarşıdan gələn təhlükəni nəzərə alaraq şəhərin bir neçə izzətli şəxsləri evimi dəyişməyi mənə məsləhət bildilər. Həmin xahişə binaən bir gecə əyləşib diqqətlə sual etdim ki, bu davada fəth, nüsrət və qələbə biz müsəlmanlarla olacaq, yoxsa erməni tayfası ilə? İstixarə etdikdən sonra bu növ cavab zühura gəldi:

Qələbə yaxın günlərdə sizinlədir.
Bütün düşmənlər sizin ayağınızın altındadır.[3]

Sonra bu beyti yazıb qazixanədə yığıncaqda söylədim. Bir para adamlara isə bu beyti yazıb verdim ki, cürətləri daha da artsın, ümidsizlər cəsarətə gəlsinlər.

İkinci dəfə istixarə etdim ki, mənim evim kilsəyə yaxın olduğundan ona zərər dəyər, ya yox? Zərər dəyərsə, köçüm. Belə cavab gəldi:

Baxmayaraq ki, sənin evin kilsəyə yaxındır,
Qəm yemə, axırı xeyirlidir.[4]

Bundan sonra Allah-təalanın köməyinə arxalanaraq evimdən köçmək fikrindən daşındım. Allah-təalaya dualar oxuyub onun köməyinə ümid bağladım.

Xülasə, seşənbə günü (çərşənbə axşamı) günortadan sonra camadi üs-sani ayının 23-də 1323-cü ildə (16 avqust 1905-ci il) ermənilər hücuma başladılar. Erməni qımdatları dəstə-dəstə olub bir dəstə Köçərli məhəlləsinə, bir dəstə Yuxarı Xəlifəli qapısına, başqa bir dəstə isə meydana tərəf getdilər. Qalan ermənilər isə səngərlərə doldular. Köçərli məhəlləsində qədim bir tayfaya mənsub, gözəl ev-eşiyi olan doxsan yaşlı Abbas bəy adlı bir nəfər yaşayırdı. Köçərli məhəlləsinə gedən dəstənin içərisində olan Çopur bəyin oğlu və Kolya adlı iki erməni Abbas bəyi çağırdılar. Abbas bəy evdən çıxanda ona dedilər ki, sən bizim qonşumuzsan, səninlə bizim işimiz yoxdur. Sonra isə Abbas bəyi sözə tutub tüfənglə vurdular. O biçarə güllədən al qana boyanıb yıxıldı. Ermənilər bir neçə güllə də Abbas bəyin yeganə oğluna və qardaşı oğluna vurub hər üçünü öldürdülər. Bundan sonra onlar evə benzin və neft töküb odladılar. Vurulanların da meyidlərinə od vurdular. Bundan sonra ermənilər üç gün idi ki, gəlin gətirmiş Nuşirəvan adlı bir yazığı da güllə ilə vurub öldürdülər. Sonra isə gəlinin cehizinə və evə, eləcə də meyidlərə neft töküb evlə bərabər yandırdılar. Beləliklə, onlar on beşə qədər evi mal-dövləti ilə yandırıb külə döndərdilər. Ev sahibləri övrət-uşaqla çıxıb qaçsalar da, onlardan iki-üç nəfəri şəhid oldu.

Xəlifəli qapısına gedən erməni dəstəsi isə on evə hücum etdilər. Ev sahibləri xəbərsiz olduqlarından onların arasında çaşqınlıq düşdü. Ermənilər bu evləri güllələbaran etdilər. Bu evlərin sakinləri qaçıb yaxındakı rus kazarmasına doldular. Buna baxmayaraq, üç nəfər erməni gülləsinin qurbanı oldu. Ermənilər isə müsəlmanların mal-dövlətini talan edib evlərinə od vurub yandırdılar.

**Ə L A V Ə:** Meydandakı qımdat dəstəsi isə bazara gəlib əlləri ilə bütün dükanlara işarə etdikdən sonra ermənilər şaraqqa-şaraq dükanları bağlayıb

[3] Beyt fars dilindən sətri tərcümədir.
[4] Beyt fars dilindən sətri tərcümədir.

əllərində tüfəng və tapança ilə meydana töküldülər və böyük hay-küy qalxdı. Onlar əvvəlcə iki nəfər Zarıslı müsəlmanı şəhid etdilər.

Ermənilərin bazarında on beşə qədər müsəlman dükanları var idi. Ermənilər hücum edən kimi bu dükanların hər birində bir və ya iki müsəlman var idi. Hücum başlayan kimi onların bir parası qaçdı, bir parası isə dükanları bağlayıb içərisində qaldılar. Bir parası isə yaxın dostluq etdikləri erməni dükan sahiblərinin dükanına və evlərinə pənah gətirdilər. Ermənilər isə onları güllə ilə qarşılayıb hamısını öldürdülər. Ermənilər müsəlman dükanlarının qapılarını açıb içəridəkiləri öldürüb, mal-dövlətlərini qarət və talan etdilər. Quru meyvələri isə yemək üçün səngərlərdə vuruşan qımdatlara göndərdilər. Həmin günü erməni bazarına alış-verişə gəlmiş müsəlmanlardan bir parası qaçıb canını qurtarsalar da, yaşlıları güllələyib öldürdülər. Ermənilər yara alanlara da rəhm etməyib tutduqları yerdə çox əzabla öldürdülər. Bu qırğında ermənilər əllərinə keçən müsəlmanları böyük işgəncə ilə öldürərək onların burun-qulağını, cinsi əlaqə üzvlərini kəsərək başlarına mıx və mismar çalmışdılar. Meyidləri ip ilə sürüyüb dərələrə, xəndəklərə ataraq gizləyir, üstlərində olan pulları isə götürürdülər. Ələ keçən cəsədlərin çoxunda beş-on yerindən yara aldığını görürdülər. Bəzi cəsədləri isə ermənilər od vurub yandırırdılar. Müsəlmanlar isə öldürdükləri adama bir yaradan artıq güllə vurmazdılar. Cəsədlərə isə toxunmayaraq düşdüyü yerdə də qoyub gedərdilər. Dəxi namərdlik edib ermənilər kimi ölənə və cəsədə işgəncə verməzdilər.

Ermənilərin hücum etdiyi həmin gün müsəlmanlar heç nədən xəbərsiz öz işlərində və alverlərində idilər. Müsəlmanlərın əyan-əşrəfləri isə Cümə məscidində təziyə məclisində əyləşmişdilər. Mərhum olmuş lənbəranlı Mehrəli əfəndinin cənazəsini bir neçə molla ilə Lənbərana göndərdikdən sonra onlar məsciddə təziyə saxlayırdılar. Bu zaman bir neçə nəfər gəlib xəbər verdi ki, nə oturmuşsunuz? Ermənilər dünyanı qarışdırıb, yuxarıda ələ düşəni öldürürlər. Oranın hakimi Xosrov bəy atla gedərkən nökəri ilə birlikdə onu güllələbaran ediblər.

Xalq bu xəbəri eşidən kimi qalxıb məscidi və dükan-bazarı bağlayıb hər yana səs saldılar. Sonra salavat çəkib və «Ya Əli!» deyə qışqıraraq on beş dəqiqə ərzində igidlər və cavanlar silahlanıb, əllərində tüfəng, tapança, qılınc, balta və bel, külüng və ling bazar və küçələrə çıxıb dəstə-dəstə hazır oldular. Onların «ura» sədası hər yana yayıldı.

Bu qovğa qalxarkən müsəlman bazarında olan erməni sövdəgər və sənətkarları qorxuya düşüb dükanları bağladılar. Onların bəzisi dükanların içərisində gizləndilər, bəziləri isə müsəlmanların evlərinə pənah gətirdilər. Müsəlmanlar onlara pənah gətirən erməniləri hörmətlə qarşılayaraq evlərində gizlədib mühafizə etdilər. Elə ki, gecə oldu, bazar darğası (polisi) İsmayıl bəy müsəlman bazarındakı dükanlarda gizlənmiş erməniləri ordan çıxarıb, dükanları bağladı, onları isə evlərinə aparıb orda saxladı.

Beləliklə, müsəlmanlar dəstələrə bölündükdən sonra əllərində silah nərə çəkə-çəkə erməni məhəllələrinə tərəf üz qoydular.

Otuz ildən bəri ermənilər tədarük etdikləri və evlərdə, məxfi yerlərdə, qəbiristanlıqda, kilsələrdə, qayalıqlarda gizlətdikləri müxtəlif növ silahları bu gün aşkara çıxararaq müsəlmanlara tərəf yönəltmişdilər. Həmin silahlara sarılaraq müxtəlif səngərlərdən, evlərin pəncərələrindən və gizli yerlərdən küçə ilə gəlib-gedən, evlərin balkonlarında dayanan və görünən böyük-kiçiyi gülləyə tuturdular.

Erməni məhəlləsi şəhərin hündür yerində olduğundan və müsəlman məhəllələri aşağı yerində yerləşdiyindən onların mövqeyi daha əlverişli idi.

**Ə L A V Ə:** Şuşakəndin və Keşiş kəndinin erməniləri müsəlman məhəllələrinin müqabilində Topxana deyilən yerdə səngərlər tərtib etmişdilər. Odur ki, ermənilər həmin kəndlərdən gəlib bu səngərlərdən də müsəlmanları atəşə tuturdular. Bütün bu hazırlığa baxmayaraq, Allah-təalanın köməyi ilə heç bir iş görə bilmədilər.

Müsəlmanlar da bir neçə yerdə səngərlər tərtib etmişdilər. Birinci səngər Vəzirzadələrin evinin qabağında, ikinci səngər isə Hası Həsən Qaraşirzadənin evinin içində və baş tərəfində idi. Bu səngərləri tərtib edən və onların başçısı Abbas bəy Talıb bəy oğlu idi. Üçüncü səngər isə Məşədi Kərimin və erməni Xaçatur oğlunun evləri idi. Bu səngərləri yaradan və onların rəhbəri bizim Mir İbrahim Ağamirzadə idi. Dördüncü səngər isə Ağadədəlidə idi. Onun da böyüyü və rəhbəri Əfrasiyab Hacı Əzim oğlu idi. Beşinci səngər Təzə məhəllədə yerləşirdi. Onun rəhbəri isə Məşədi Abış Bəylər bəy oğlu idi. Altıncı səngər isə mərhumə Gövhər ağanın evi və həyəti idi. Bu səngərin rəhbəri və istiqamətvericisi cənab Axund Molla Şükür idi.

Şəhərin əyanları və nücəbaları şəhər sakinlərini, cavanları və igidləri müdafiəyə qaldıraraq səngərlərə göndərirdilər. Özləri də tez-tez gəlib səngərlərə baş çəkib gedirdilər. Xüsusən cənab Nəcəfqulu ağa, cənab Şeyx Hüseyn və cənab Axund Molla Qasım tez-tez bütün səngərlərə baş çəkir, xalqı cəsarətlə müdafiə olunmağa ruhlandırırdılar. Molla Qasım paltarını dəyişərək döyüşçü libası geyinmiş halda, tüfəng çiynində dəstə-dəstə Qala və Çöl cavanlarını götürüb «Ya Əli!» nərəsi çəkə-çəkə səngərləri gəzir, döyüşçüləri ruhlandırmaq üçün heyrətamiz sözlər və şüarlar deyirdilər.

Ermənilər hündür evlərdən və səngərlərdən müsəlman binalarını və küçələrini gülləbaran edir, xalqın gediş-gəlişinə mane olurdular.

Müsəlman tərəfdən isə İran konsulunun müavini Ağa Məmmədcəfər də cavanlarla məscidlərin minarələrinə çıxıb gözə görünən erməni quldurlarını güllə ilə vurub həyatlarını kəsirdilər.

Davanın ilk günü müsəlmanlar səngərlərdən güllə atmaqla erməniləri məşğul etdilər. Müsəlman səngərlərinin yaxınlığındakı erməni evlərinin bir parasının sakinləri qaçmış, bir parası isə darvazaları bağlayıb içəridə gizlənmişdilər. Müsəlmanlar səngərlərinin qarşısında olan həmin evlərin divarlarını linglə deşib içəri daxil olub, od vurub yandırdılar. Od vurulmuş evlərin hamısını alov bürüdü. Ərşə qalxan alov ətraf kəndlərdən və qayalardan görünürdü.

İkinci gün ermənilərin evlərini yandıraraq onları geri oturtdular. Üçüncü gün ikinci və üçüncü səngərin igidləri Xoca Söhrab kilsəsi adlanan Böyük kilsəyə çatdılar. Evlərə düşmüş yanğın artıq gəlib Təzə kilsənin ətrafına çatmışdı. Ermənilər ordan da geri çəkildilər. Dördüncü səngərin cavanları isə gəlib Cəmşid bəyin evinə çatdılar.

Bir para adam Cəmşid bəyin və Bəhram bəyin evlərinin yandırılmasını məsləhət görmədilər. Çünki Şahnəzərovlar həmişə müsəlmanların dostu olublar. Buna görə də onlara hörmət əlaməti olaraq evləri yandırılmasın. Lakin qabaqcadan qərara alınmışdı ki, hansı evdən müsəlmanların üzərinə güllə atıldı, o ev mütləq tar-mar edilməlidir. Cəmşid bəyin evinin balkonundan isə iki minə qədər güllə atılıb. Bu güllələrdən bir neçəsi uşaqlara dəyib yaralayıb. Yüz güllədən artıq isə məscidin taxtapuşuna, minarələrinə dəyib deşibdi. Bundan başqa bizim hörmətli seyidimiz Mir Möhsün Ağanın hücrəsinin pəncərəsinə on iki güllə vurulub deşik-deşik edilmişdi. Amma yenə hörmət əlaməti olaraq evi yandırmayıb getdilər. O evin ətrafında qəbiristanadək od vurdular. Külək vasitəsilə ətraf evlərdən Cəmşid bəyin evinə də od düşüb yandı. Bəhram bəy və Qriqor bəyin evləri də alovların cənginə keçdi.

Cavanlar evlərə od vurduqdan sonra qəbiristanlıqdan keçib yaxınlıqda yerləşən bir erməni fahişəxanasına çatdılar. Fahişəxananın darvazasını sındırıb evə on yerdən od vurdular. Orada olan erməni fahişələrinin bir neçəsi öldü, bir neçəsi isə bayıra qaçaraq müsəlman döyüşçülərinin ayağına sərilərək aman istədilər. Döyüşçülər onları bağışladılar.

Üçüncü gün hər bir müsəlman kəndindən yeddi yüzə yaxın atlı və piyada köməyə gəldi. Onlar səngərlərə paylanaraq döyüşü davam etdirdilər.

Bu davadan əvvəl erməni tayfası məktəb tikdirirdi. Həmin binanın tikintisində on səkkiz nəfər İran müsəlmanlarından fəhləlik edirdi. Dava başlayan kimi bina sahibi onları bir evə dolduraraq heç yana çıxmamalarını tapşırdı və bildirdi ki, əks təqdirdə ermənilər onları görsələr, hamısını öldürəcəklər, sonra vaxt tapıb sizi yola salarıq. Onlar da bu erməninin sözünə inanıb o evdə gözləməli olurlar. İranlı fəhlələrdən biri erməninin sözünə inanmayıb nə yollasa sonradan qaçıb canını qurtarır. Ev sahibi isə axşam ermənilərə xəbər verib onlarla birlikdə İran fəhlələri gizlənən evə gəlirlər. Qələmlə yazılması qeyri-mümkün olan erməni vəhşiliyi nəticəsində orada olan 17 nəfər İran fəhləsi böyük zülm və işgəncə ilə öldürülür. Ermənilər onların başına mismar çalaraq əzdikdən sonra cəsədlərini bir dərəyə ataraq üstlərini peyinlə basdırmışlar.

Müsəlmanlar əhvalatdan xəbərdar olduqdan sonra gedib onların cəsədlərini çıxarıb gətirirlər. Onların bəzilərinin cəsədləri parça-parça olduğundan təyəmmüm (təmizləyib) edib o birilərinə qüsul verib kəfənə tutdular və hörmətlə Cıdır düzündə dəfn etdilər.

Qalaya kənd yerlərindən köməyə gəlmiş atlılar dalbadal şəhərə daxil olduqdan sonra dəstə-dəstə olub səngərlərə və keçidlərə doluşdular. Bir azdan

sonra «Ya Əli!» nərəsi çəkib hücuma keçdilər. Onlar erməniləri geri oturdub evlərinə və dükanlarına od vurub yandırdılar. Hər hansı erməni qaraltısı görürdülərsə, güllələbaran edirdilər. Ermənilər get-gedə geri çəkilir, müsəlmanlar isə qələbə ilə irəliləyirdilər. Həmin gün səs-küy, çığırtı və «Ya Əli!» sədaları, tüfənglərin gurultusu və ermənilərin qışqırtısı yeri-göyü lərzəyə gətirirdi. Yanan evin və dükanların alovu və tüstüsü kəhkəşana yetişmişdi. Həmin günün gecəsi yanan evlərin işığına neçə mil məsafədə kağız yazıb-oxumaq mümkün idi. Vəzirzadələrin evlərinin qabaq səmtinə od vura-vura gedirdilər. İki yolun ortasında bir ev var idi. Müsəlmanlar ona da od vurmaq istəyərkən bir nəfər evdən çıxıb onların yanına gəldi və iztirabla cavanlardan xahiş etdi ki, Allah xatirinə bu evi yandırmayın! Çünki mən bu evi icarəyə götürmüşəm və külfətim hal-hazırda burada yaşayır, bütün mal-dövlətim bu evdədir. Cavanlar həmin müsəlman kişisinin dediklərindən sonra buyurdular ki, bütün evlərdən çox bu evi odlamaq fikrində idik. Çünki bir erməni bu evin altında şirəxana (tiryək çəkilən yer) dükanı düzəltmişdi.

Həmin erməni gedib Allahın evini ziyarət etdikdən sonra gəlib bu şərabxananı açıb, oraya hər gün, hər gecə fasiq, facirlər gəlib, bu dükanda müsküratdan içib, zinakarlıq və əlli cür fasiq əməllərlə məşğul olurdular. Evin yandırılmasının qeyri-mümkün olduğunu görən cavanlar qərara aldılar ki, heç olmasa onun altındakı şərab və tiryək dükanını dağıdıb tar-mar etsinlər. Onlar bu məqsədlə dükanın qapısını sındırdılar və içəri daxil oldular. Gördülər ki, hər biri otuz-qırx pud şərab tutan neçə boçkalar vardır. Onlar güllə ilə boçkaları dəlmə-deşik etdikdən sonra şərab sel kimi axmağa başladı. Rus kazakları isə əhvalatdan xəbərdar olan kimi bu axan şərabları vedrələrə doldurub aparmağa başladılar. Bir müddət üfunət iyindən o dükanın qabağından keçmək mümkün olmadı. O dükanda olan yüzlərlə şüşələrə doldurulmuş cürbəcür içki və müskurat da çölə atılaraq sındırılmışdı. Bir neçə gündən sonra həmin evdə yaşayan müsəlman başqa bir müsəlman evinə köçmək məcburiyyəti qarşısında qaldı. Ondan sonra bu erməni evini yenidən dağıdıb tar-mar etdilər.

Məhəmməd adlı bir oğlan danışır ki, bütün aləmi insan çığırtısı, nalələri, döyüşçülərin nərələri və tüfənglərin səsləri bürüyəndə və evlər alovlanaraq yananda gördüm ki, bir rus keşişi yanan evlərin arasında icarə etdiyi evdən çıxaraq bir övrətlə müsəlmanların içinə gəldi. Həmin keşiş mənim əlimdən tutub dedi ki, sənin evin hardadır? Mən də dedim:

— O müqabildə görünən ev mənimdir.

Rus keşişi xahiş etdi ki, bu övrət yanğından qorxduğuna görə və onların evlərini alov əhatə etdiklərinə görə bir neçə gün onları öz evində saxlasın. Məhəmməd onları sakitləşdirib, öz evini onlara verəcəyinə razı oldu. Bundan sonra o rus keşişi ilə övrəti öz evinə gətirib onlara dedi:

— Nə qədər istəsəniz, bu evdə qala bilərsiniz.

Onlar Məhəmmədin evində üç gün qaldılar. Ara bir az sakitləşdikdən sonra keşiş Məhəmmədi çağırıb dedi ki, bu qədər ki, sən bizə hörmət etdin, bunun əvəzini çıxmağa bizim heç nəyimiz yoxdur. Qoy Allah-təala sənə əvəzini versin. Keşiş üzünü şərqə tərəf tutub çoxlu dualar oxudu və övrət də amin dedi. Ondan sonra onlar Məhəmmədlə əl tutub xudahafizləşərək yola rəvan oldular. Məhəmməd onları ötürüb geri qayıdır.

**Ə L A V Ə:** İkinci səngərdən yuxarı daşlıq yolda bir böyük imarət var idi. İmarət keşişli Xaçikinki idi. İçində kazak polku olurdu. Müsəlmanların səngəri o evin qabağında yerləşirdi. Müsəlman igidləri həmin mövqedə erməni səngərlərini gülləbaran edirdilər. Bir də gördülər ki, o evin taxtapuşundan neçə erməni və neçə kazak onları gülləyə tutublar. Bunu görən kimi igidlər qışqırıb tüfənglərin ağzını taxtapuş səmtə çevirib onların üstünə güllə yağdırdılar. Kazaklar bu fitnəkarlığın üstünün açılacağından ehtiyat edərək və böyüklərin tənbehindən qorxaraq taxtapuşdan endilər və öz mənzillərinə getdilər. Sonra məlum oldu ki, həmin kazaklar ermənilərdən pul və patron alıb müsəlmanlara qarşı ermənilərə kömək etmişlər. Sonra kazaklar ermənilərlə əlbir olub həmin evə od vurdular. Kazaklar da həmin yerdən köçüb ayrı yerdə məskunlaşdılar. Yenə həmin gecə kazaklar ermənilərlə əlbir olub müsəlmanların səngərlərinə güllələr atdılar.

Elə ki, sakitlik oldu, kazaklardan biri belə nəql etdi ki, bizim hər birimizə bir manat pul və iyirmi patron verirdilər ki, onlara kömək edək.

**Ə L A V Ə:** Davadan əvvəl Şuşanın erməni tayfası hər yerə kağızlar yazıb göndərərək kömək istəmişdilər. Həmin kağızların birini də Tiflis şəhərinə yazıblarmış. Tiflisdə neçə yüz erməni və gürcü gəlib Şuşada müsəlmanlara qarşı vuruşmuş və əksəriyyəti burada həlak olmuşdular. Belə ki, davadan sonra Tiflisə ancaq 60 nəfər qayıdır. Əhvalatdan xəbərdar olan gürcülər istəyirlər ki, toplaşıb həlak olanların əvəzinə, ordakı İran müsəlmanlarını qırsınlar. Lakin gürcülərin bir parası buna razı olmayıb mane olmuşdular.

Xülasə, ikinci səngərin cavanları ermənilərə güc gəlib onları geri oturtduqdan sonra gördülər ki, iki erməni övrəti və bir erməni kişisi «Ya Həzrəti Abbas!» deyə-deyə müsəlmanlara tərəf gəlirlər. Kənd yerindən gəlmiş müsəlmanlardan biri onların üstünə bir neçə güllə atdısa da, onların heç biri dəymədi. Buna kimi onlar səngərlərə çatdılar və ağlaya-ağlaya «Ya Həzrəti Abbas, bizə kömək ol!», deyə müsəlmanlardan aman istədilər.

Bu üç erməni əsirini gətirib bizim evə (M. M. Nəvvabın evinə) qoydular. Ermənilərlə müsəlmanlar arasında barışıq olduqdan neçə gün sonra həmin ermənilər öz yerlərinə getdilər. Erməni kişisinin adı Baxış, övrətdən birinin adı Bənövşə, o birinin adı isə Zəri imiş.

Müsəlmanlar hər ləhzə «Ya Əli!» nərəsi çəkə-çəkə səngərdən-səngərə irəli gedib hər saat qələbələr əldə edirdilər. Abbas bəyin dəstəsi yürüşünü davam etdirərkən yolunda evləri odlaya-odlaya Manas Muğdusi oğlunun evinə kimi çatdılar. Mir İbrahim və Ağa Şəmilin dəstələri isə litoqrafiya çapxanasına

çatmışdılar. Dördüncü və beşinci səngərlərə rəhbərlik edən Əfrasiyab və Məşədi Abış bəy öz dəstələri ilə sudxana istiqamətində hücuma keçərək gəlib oraya çatdılar.

Bu dəstələrin igidləri ermənilərin üzərinə yürüş edərkən cənab qubernator durbinlə vuruşa baxırmış. Müsəlmanlar əllərində tüfəng əyilə-əyilə gedib ermənilərin səngərlərinə daxil olaraq onları güllәbaran etdiyini görən qubernator əl-ələ vurub təəccüblə demişdi:

— Bu hünər heç yaponda da olmayıb. Heç bir nizam görməyən bir millətin belə bir hünər göstərərək səngərlər tutması çox qəribədir.

Kəndistan yerindən gəlmiş igidlər və yerli cəngavərlər bir-birinin ardınca küçələri və səngərləri tutduqca şur və fəğan, «Ya Əli!» sədası, «Ura-ura!» səsləri və tüfəng gurultusu fələyə qalxırdı. Odlanan dükanlar və evlər hər tərəfdə alışıb yanırdı. Xüsusən taxtalarla dolu olan bir neçə dükanın alovu fələyin yanına qalxmışdı. Belə ki, həmin dükanların alovu dörd ağac məsafədən görünürmüş.

Kərkicahan kəndinin adamları deyirdi ki, həmin gün yanğın vaxtında saysız-hesabsız yarım yanmış kağızlar dalbadal kəndin üstünə tökülürdü.

Müsəlmanlar Manas Muğdusi oğlunun evinə, yuxarı meydanın üstünə və Xublar oğlunun şirəxanasına kimi bütün dükan və evlərə od vurub yandırmışdılar. Eləcə də dərədə olan neçə mərtəbəli evlər, dükanlar və karvansara tamam od tutub yanırdı.

Üçüncü səngərin adamları da kilsənin qiblə tərəfindən basmaxanaya qədər evlərə və dükanlara od vurmuşdular. Təzə kilsənin ətrafındakı evlər də yandırılmışdı.

Dördüncü səngərin əhli Cəmşid bəyin evinin dövrəsində olan imarətlərə vurduqları alovdan Cəmşid bəyin və Şəhnəzərovların mülklərinə, üzbəüzdə olan evlərə, o cümlədən Ümrüd bəyin, Xandəmir oğlunun, Cavad bəyin və Ümrüd bəyin oğlanlarının evlərinə də od vurub yandırmışdılar. Bundan əlavə, sudxana və Duma divanxanası, xülasə bu qəbildən böyük evlər və ətrafında da olan imarətlər, dükanlar tamam alışıb-yandı.

Kilsələr məbədgah olduğuna görə onlara toxunmayıb od vurmadılar. Buna baxmayaraq, bir neçə tərəkəmə darvazaya od qoyub kilsəni yandırmaq istəyərkən şuşalılar onu söndürüb onlara acıqlanaraq demişlər:

— Kilsə və məscidlərə hörmət etmək lazımdır.

**Ə L A V Ə:** Bunu da bilmək lazımdır ki, ermənilər Xəlfəli qapısının müsəlman evlərini o cümlədən köçərlilərin, kazakların, Süleymanın, Allahverdinin, Məşədi İsmayılın evlərini, sud və Duma divanxanalarını yandırmışlar. Davadan əvvəl ermənilər sud və Duma divanxanalarını yandırıb günahı müsəlmanların üstünə yıxmaq istəyirdilər. Məhz dava başlanarkən həmin imarətləri yandırdılar ki, müsəlmanlar müqəssir hesab olunsun.

Elə ki, bu evlər yanmağa başladı, onların alovları və qığılcımları qərb tərəfə — erməni məhəlləsi tərəfə yönəldi. Vahid Allahın iradəsi ilə od-alovun hər tərəfə

yayılmasının nəticəsi olaraq erməni məhəllələrinin əksər evləri, imarətləri və dükanların içində olan əşyaları və malları tamam yanıb, divarlardan başqa bir şey qalmadı.

## KƏRBƏLAYI İSGƏNDƏRİN ƏHVALATI

Kərbəlayı İsgəndər adlı bir şəxs mənə danışdı ki, dava günü biz üç nəfər yuxarı erməni bazarına çıxmışdıq. Bir də gördük ki, ermənilər bir-birinə qarışaraq dükanları bağlayır, əllərində tüfəng və tapança küçələrə çıxır, harada müsəlman görürdülərsə gülləyə tuturdular. Heç nədən xəbərləri olmayan silahsız müsəlmanlar isə bu hücumun qarşısında hərəsi bir tərəfə qaçırdı. Bəzisi qaçıb qurtarır, bəzisi yaralı canını qurtarmağa cəhd göstərir, bir qismi isə yaralı yıxılıb qalırdı. Biz üç nəfər də bu vəziyyəti görüb dəhşətə gəldik və qaçmaq istədik. Lakin gördük ki, bütün dükanların qarşısında silahlı ermənilər dayanıbdır. Əgər qaçsaydıq, bizi hər tərəfdən güllələbaran edəcəkdilər. Əlacsız qalıb orada olan bir müsəlman papaqçı dükanına girdik. Dükanın sahibi Aslan adlı bir nəfər idi. Aslan durub tez dükanın qapısını çəkib içəridən bağladı və arxasına böyük şeylər qoydu ki, açılmasın. Bunu görən ermənilər tez qaçıb dükanı gülləyə tutdular. Güllələr qapını deşib içəri keçirdi. Biz isə içəridə hərəmiz bir divar dibinə qısılıb qalmışdıq. Mən birtəhər qalxaraq dükanın arxasındakı taxtanı çıxartdıqdan sonra ona bitişik olan ikinci dükana keçdik. Həmin dükanın sahibi də dükanı bağlayıb getmişdi. Gördük ki, dükanda bir dəstə lavaş və yanında da dolu bir qab su var. Sudan bir az içdik. Sonra fikirləşdik ki, nə edək. Axşam düşəndən sonra lavaşdan bir qədər yeyib sudan içdikdən sonra həmin dükanda gecələməli olduq. Lakin yata bilmədik. Sübh olan kimi mən qalxıb o dükanın bir tərəfinin divarının üstünü açdım. Mənimlə orada olanlardan birisi dəmirçi Süleyman, o birisi isə Cəmil adlı bir şəxs idi. Mən divarın üstündən aşdığım yerdən gördüm ki, bazar-dükan, ev-eşik tamam od tutub yanır. Alov artıq biz olan dükana yetişirdi. Amma bazarda bir nəfər də olsun erməni görünmürdü. Onların hamısı böyük meydana yığılıbmış. Müsəlmanların da «Ya Əli» sədası eşidilirdi. Mən alovun yaxınlaşdığını görüb özümü birtəhər açdığım yerdən bayıra atdım. Yoldaşlarıma da xəbər verdim ki, tez bayıra çıxsınlar, od-alov artıq dükana çatır. Onlar hərəkət edib divara çıxana kimi od-alov dükanı bürüdü. Onlar karıxaraq ikisi də divarın üstündən dükanın içəri tərəfinə yıxıldılar. Mən böyük çətinliklə divarların dalı ilə gəlib evimizə çatdım. Gördüm külfətim hamısı ağlaşırlar. Bir qızım özünü saçından asıb allaha duva edirdi. Elə ki, məni gördülər, hamısı ayağıma düşdülər.

## ŞÜKÜR BAQQALIN ƏHVALATI

Yuxarıda deyilənlərdən daha qəribə bir əhvalat qalalı Şükür Kərbəlayi Allahverdi oğlunun başına gəlmişdi. Bu haqda o belə danışır:

— Mən və qardaşım Həsənin yuxarı erməni meydanında baqqal dükanımız var idi. Dükanlarımız quru meyvə ilə dolu idi. Alış-verişimiz də yaxşı gedirdi. Günlərin bir günündə (yəni dava başlanan günü) bir də gördük ki, nə qədər dükanlarda alış-veriş edən erməni vardısa, hamısı bir-birinə qarışıb hay-küy yarandı. Sonra isə dəstə-dəstə olub müxtəlif səmtlərə getdilər. Ermənilərdən sual etdik ki, nə hadisə baş verib? Onların heç biri cavab vermədi. Bu vaxt mən gördüm ki, atlı qımdatlardan birisi tələsik gəlib erməni dükan sahiblərinə nə dedisə, onlar o dəqiqə dükanları şaraqqaşaraqla bağlayıb, dəstə-dəstə olub əllərində tüfəng və tapança hər tərəfə yayıldılar. Gənclər meydanına və bazara doluşan əli silahlı ermənilər harada müsəlmanlara rast gəlirdilərsə, gülləyə tuturdular.

Burada dükanı olan Əli Molla Məcid oğlu adlı bir cavan vəziyyəti belə görüb qaçıb mənim dükanıma gəldi. Mən isə dükanı bağlamağa fürsət tapmayıb Əli ilə birlikdə dükanın arxasında yerləşən zirzəmiyə girdik. Bizim buraya girməyimizi görən ermənilər zirzəmini mühasirəyə alıb atəşə tutdular. Mənim də içəridə bir tapançam və on beş gülləm var idi. Mən də başladım onlara cavab atəşi açmağa. Çartaz əhlindən bir erməni cəsarətlə istəyirdi ki, zirzəmiyə tərəf gəlsin. Həmin dəm tapança ilə onun sinəsindən vurdum. Erməni çığırıb yıxıldı. Cavab atəşini və çartazlının öldürülməsini görən ermənilər qorxudan geri çəkilib uzaqdan atəş açmağa başladılar. Mənim yanımda çoxlu tüfəng gilizləri var idi. Hər dəfə tapançadan atəş açarkən həmin gilizlərdən birini dərhal bayıra atırdım. Onlar tüfəng gilizlərini görüb xəyal edirdilər ki, məndə tüfəng var. O gecə oğlanla birlikdə bu qərar ilə zirzəmidə qaldıq. Zirzəminin bir tərəfində dəmirdən bir pəncərə var idi. Həmin pəncərəni çox böyük zəhmətlə sökərək çıxartdıq. Həmin pəncərə ilə üzbəüz bir anbar var idi. Həmin pəncərədən anbarın taxtapuşuna çıxaraq oradan içəri endik. Böyük həcmli olan anbarın içərisi müxtəlif əşyalarla dolu idi. Dəmir sac və aftafalar daha çox idi. Oğlan yalvardı ki, mən bir küncdə gizlənim, sən isə dəmir sacları mənim ətrafıma düz ki, güllə dəyməsin. Sonra oğlan bir bucağa qısıldı, mən isə sacları onun ətrafına düzdüm. Başqa səmtə gələrək gördüm ki, bir zirzəmi var. Onun qapısına böyük bir qıfıl vurulmuşdu. Yerdən daş parçası götürüb onunla qıfıla bir neçə zərbə endirərək sındırdıqdan sonra zirzəmiyə girdim. Zirzəmidə çoxlu və böyük parça tayları var idi. Həmin parça taylarından bir neçəsinin götürüb qapını örtüb onun arxasına qoydum. Bundan sonra bir az sakitləşdim. Zirzəmidə o yan-bu yana baxaraq içərini axtardıqdan sonra gördüm ki, ağzı örtülü bir küpə var. Küpəni açanda onun içərisində qatıq olduğunu gördüm. Şükr edib qatıqdan bir az içdikdən sonra özümə gəldim. Üç gün idi ki, ermənilər hər tərəfdə müsəlman axtara-axtara gəlib həmin anbara doluşdular. Anbarın hər tərəfini yoxladıqdan sonra oğlanın orada olduğunu hiss etdilər. Sonra sacları o

tərəf-bu tərəfə atıb Əlinin orada gizləndiyini gördülər. O dəmdə hər tərəfdən atəş açıb onu öldürdülər. Ermənilər tüfəngin səsinə anbara gəlirdilər. Ermənilər oğlanı öldürdükdən sonra oradakı aftafalardan bir neçəsini götürüb onun başına vuraraq əzdilər və bütün bədən üzvlərini kəsdilər. Ermənilər oğlanın cəsədinə olmazın işgəncələr verdikdən sonra mən gizləndiyim yerə tərəf gəldilər. Qıfılın sındırıldığını görüb içəridə adam olduğunu bildilər. Onlar zirzəminin qapısını açmaq istəyərkən mən pəncərədən bir güllə atdım. Güllə bir erməninin dodağına dəyib dişlərini tökdü. Həmin erməni çığırıb qaçdı. O biriləri də tez qapıdan uzaqlaşdılar. Ondan sonra Mesrop adlı tanıdığım bir erməni gəlib divarın dalından məni dilə tutaraq dedi ki, ağa Şükür, sən çölə çıx, mən səni ermənilərdən qoruyaram, qoymaram ki, sənə əl vursunlar. Mən müsəlmanların çörəyini yemişəm. Mən sənə xəyanət etmərəm. Mən ona cavab verdim:

— Siz erməni tayfasına inanmaq olmaz. Sən deyirsən ki, artıq müsəlmanlarla barışıq etmişik. Əgər doğru deyirsənsə, get qazini və ya Xosrov bəyi gətir, ondan sonra mən buradan çıxaram.

Bunu eşitcək Mesrop acıqlanıb qazi və Xosrov bəyin ünvanına söyüşlər yağdırdı. Mən də cavab olaraq Mesropun özünü və keşişlərini söydüm.

Bu minvalla qatıqdan az-az içib vaxtımı keçirirdim. Beşinci gün bir də gördüm ki, qardaşımın səsi gəlir, musiqi səsi də eşidilirdi. Eşiyə çıxıb qardaşımla evə gəldim.

O insafsız erməni tayfası dükanda olan nəqd pulu və malları, o cümlədən çuval-çuval quru meyvələri və digər satış mallarının hamısını talan və qarət etmişdilər.

...Xülasə, sözümüz həmin yerdə qaldı ki, müsəlman igidləri irəliləyərək ermənilərin evlərinə od qoyurdular. Od-alov yuxarı qalxdıqca ermənilər geri qaçırdı, səngərləri isə boş qalırdı. Müsəlmanlar isə onların səngərlərini ələ keçirib, darmadağın edir və yandırırdılar. Müsəlmanlar hər tərəfdən irəliləyərək ermənilərin mövqeyini ələ keçirirdilər. Onlar Böyük kilsəni, Aşağı meydanı və Qapanı da tutdular. Ermənilərin kişi, övrət və uşaqları üz qoydular qaçmağa. Onların bir parası Üçmıxdan Daşaltı tərəfə qaçdılar. Bir qismi isə əlacsız qalıb övrət—uşağını götürüb rus qazarmasına qaçıb doluşdular. Qazarma dolduğundan rusların böyüyü əsgərlərə əmr etdi ki, daha oraya heç kimi buraxmasınlar.

Bu halda qımdatlardan biri olan Baxış bəyin oğlu Kolya, bir neçə övrət-uşaqla əlində tüfəng, üstündə patrondaşlar dolu halda qazarmaya gəldi. Ermənilərin dediyinə görə, Kolya dünyaya gələndən ondan mərdüməzarlıqdan başqa yaxşı iş görməyiblər. O, rəngi qaçmış, titrəyə-titrəyə qazarmaya girib gizləndi.

Davanın dördüncü günü bütün səngərlərin igidləri söz bir olub tədbir etdilər ki, birdən «Ya Əli» nərəsi çəkib hər tərəfdən ermənilərin üzərinə hücuma keçib, onların axırıncı qüvvəsini darmadağın edib, bütün mülklərini yandırıb qələbə bayrağını kilsənin üstünə və Xəlifəli qapısına sancsınlar.

Həmin gün isə erməni məhəlləsinin sakinləri həyəcanlı kədər və məlal içərisində teleqraf vurub rus dövlətindən xahiş edirlər ki, bu fəsadı söndürmək üçün cənabi—müstətab, sərkari baiqtidar şəriətmədar Şeyxülislam cənablarını oraya (Qalaya) göndərsinlər.

## ERMƏNİ XƏLİFƏSİNİN BÜTÜN KEŞİŞLƏRİLƏ BARIŞ ÜÇÜN MƏSCİDƏ GƏLMƏSİ

Xəlifə belə ki, gördü ermənilərin arvad-uşağı ağlaşa-ağlaşa töküldülər onun qapısına, tez durub kilsə paltarını geyib böyük xaçı, kilsələrin böyük keşişləri hər biri bir İncili əlinə alıb, kilsə paltarları əyinlərində, keşişlərin əllərində qiymətli bayraq, neçə ruslar qabaqda papaqları ağacın başında, naçalnik onların dalında və ermənilərin nümayəndələri bunların dalınca musiqi çala-çala gəldilər meydana doldular. Xəlifə qabaqca, keşişlər əllərində xaç və İncil və bayraqlar bir parası ağlaya-ağlaya məscid həyətinə daxil oldular ki, bizi əfv edin, bağışlayın.

Həmin gün müsəlmanların əyan-əşrəfləri və böyük alimləri müəyyən bir işlə bağlı məscidə gəlmişdilər. Mən də (Mir Möhsün Nəvvab) bir vacib işlə əlaqədar oraya gəlmişdim. Məscidin həyətinə çatanda qonşuluqdakı qapı açıldı. Əvvəl ordan naçalnik çıxdı və mənə yaxınlaşıb əlimdən tutaraq «izvinite» sözünü deyib daxil oldu. Onun arxasınca gələn erməni xəlifəsi də mənim əlimi sıxaraq «bağışlayın» deyib içəri daxil oldular. Bu zaman cənab Hacı Molla Hüseyn qazi təşrif gətirdi. Onların ardınca müsəlmanlar da məscidə daxil olub xəlifə və keşişlərlə görüşdülər. Bundan sonra xəlifə barışıq nitqinə başladı. Bir qədər sonra məsciddən çıxdılar. Cənab qazi və müsəlmanların əyanları da onlarla erməni meydanına tərəf yollandılar. Yenə qabaqda naçalnik və ruslar musiqi sədası altında erməni məhəlləsinə doğru hərəkət edirdilər.

Aman (sülh) bayraqlarından birini mən (Nəvvab) alıb iki ay məsciddə saxladım. Sonra keşişlər gəlib həmin bayrağı geri istədilər. Cənab Nəcəfqulu ağanın vasitəsilə həmin keşişlərdən bir qəbz almaqla bərabər, həm də bayraqla birlikdə məscidin qarşısında Əfrasiyabın şəklini çəkdirdim. Bunu mən ermənilərin üstümüzə böhtan atmaması üçün əyani dəlil kimi çəkdirdim.

Ermənilərin bu növ siyasətinə və hiyləsinə inanmaq, eləcə də sülh məramına bel bağlamaq olmazdı. Çünki neçə dəfə bu qərar ilə məsciddə, kilsədə və qazinin evində bütün keşişlər, xəlifənin özü və erməni əyanları toplaşaraq çoxlu nitqlər söyləmiş, xütbələr oxumuş və dostluqdan danışmışlar. Amma axırı yenə mənasız olub. Belə ki, onlar, yəni ermənilər öz fitnə-fəsadlarından əl çəkməyərək xalqın rahatlığını kəsib onları qırğına düçar etmişlər.

Üç gün bundan sonra cənab Şeyxülislam Şuşa şəhərinə təşrif gətirdi. Şəhər əhalisi onu böyük ehtiramla qarşıladı. Şeyxülislamı üç yüz atlı, hörmətli şəxslər, alimlər, erməni keşişləri və xəlifəsi, eləcə də erməni böyükləri faytonlarda, otuz

nəfər atlı kazaklar sursatları ilə birlikdə müşayiət edirdilər. Onlar şəhərə daxil olaraq cənab qazinin evində qərar tutdular.

Elə ki, sabah oldu, yenə alimlər, seyidlər, əyan-əşrəflər, ermənilərin xəlifəsi, keşişləri və əyanları cənab Şeyxülislamın hüzuruna gələrək xoş gəldin etdilər. Bundan sonra Şeyxülislam buyurdu ki, ey erməni və müsəlman camaatı! Bir para başqa vilayətlərdə fitnə-fəsad işləri vəba xəstəliyi kimi yayılarkən məclislərdə və yığıncaqlarda mərifət əhli Şuşa qalasının erməni və müsəlman əhlinin mehriban dolanmağını misal gətirərək iğtişaş salanları məzəmmət edirdilər. Onlar Avropanın Paris şəhərində olan xoş davranışı Qafqaz şəhərləri içərisində Şuşa əhalisinin mehriban münasibətləri ilə müqayisə edirdilər.

Mənə məlumdur ki, siz iki tayfa, yəni erməni və müsəlmanlar keçmiş zamanlarda qardaş kimi dolanmısınız. Hətta Məlik Şahnəzərin qızı Hurizad xanımı mərhum İbrahim xan özünə halal övrət edib, qohum olublar. İndi sizdən sual edirəm: bu fitnə-fəsada nə bais olur?

Aranızda din-məzhəb davası, namus məsələsi yoxdur. Bəs nə üçün bir neçə şeytan cildinə girmiş insanların fitnə-fəsadına uyaraq bu qədər qanların tökülməsinə, malların tələf olub, mülklərin dağılmasına və yanmasına bais olursunuz? Qiyamət günü Allah-təalanın qarşısında bu bəd əməlləriniz üçün cavab verəcəyinizi unudursunuz? O, tezliklə zalım ilə məzlum arasında ədalətlə divan edəndir. Tövbə edib Allah yoluna qayıdın. Bir də belə fitnə-fəsadlar törətməyin. Fitnə-fəsad törətməyə çalışan bir para adamların sözünə qulaq asmayın. Onlar öz cahillikləri ilə sizin rahatlığınızı əlinizdən alıb, öz fitnələri ilə sizi qırğına verirlər. Bununla bir məqsədə və ali mərtəbəyə nail olmaq qeyri-mümkündür.

Xülasə, o biri gün səhər tezdən cənabi-Şeyxülislam məscidə təşrif gətirdi. Yenə də erməni və müsəlmanlar məscidin ətrafına toplaşdılar. Şeyx həzrətləri burda da çıxış edərək onların bütün fitnə-fəsadlara son qoymalarını və mehriban dolanmalarını nəsihət etdi. Hərbi qubernator da camaata elan etdi ki, sizin aranızda gedən vuruşlara son qoymaq və hər iki tayfa arasında (erməni və müsəlman) sülhü bərqərar etmək üçün dövlət məni buraya qubernator təyin etmişdir. Hər hansı bir fitnə-fəsadda mən məzlumun tərəfində olub zalımı tənbeh edəcəyəm. Buna mənim səlahiyyətim var.

Burdakı çıxışlardan sonra onların hamısı erməni kilsəsinin yanına gəldilər. Burda da erməni xəlifəsi və qubernator çıxış edib, hamını fitnə-fəsadlardan əl çəkib əmin-amanlığı təmin etməyə çağırdılar.

Din xadimləri və qubernator bu iki tayfa arasında sülh yaratmağa çalışdıqları vaxt xəbər gəldi ki Vəng tərəfdə ermənilər toplaşıb müsəlman köçərilərinin yolunu kəsiblər. Belə ki, min nəfərəcən əlsiz-ayaqsız övrət-uşaq, qoca kişilər və onların heyvanları yığılıb o tərəfdə meşədə qalıblar.

Bu xəbər şəhərə çatan kimi, dərhal Ağdama və Bağlar əhlinə müxtəlif kağızlar yazıb göndərdilər. Dərhal altı yüzə qədər silahlı atlılar cəm oldular və üz qoydular Vəng tərəfə. Ermənilərin səngərlərinə bir güllə atımlıq məsafədə düşüb

dəstələr təşkil etdilər. Ermənilər xəbərdar olan kimi qorxuya düşdülər və bir neçə ermənini onların hüzuruna göndərdilər ki, müsəlmanların gəlişlərinin səbəbini öyrənsinlər. Atlılar həmin ermənilərə bildirdilər ki, gəlmişik köçərilərin yollarını kəsənlərə layiqli cəza verək ki, bundan sonra bir də belə iş görməsinlər.

Ermənilər dedilər ki, biz onların yolunu kəsməmişik. Ola bilsin ki, köç tayfası bizim ermənilərlə dava ediblər və bunun nəticəsində bir-iki adam ölübdür.

Xülasə, atlılar köçərilərin yolunu açdılar, onlar sərbəst gəlib oradan keçərək öz oymaqlarına tərəf yollandılar.

Həmin günün sabahı xəbər gətirdilər ki, erməni tayfası Əsgəran səngərlərinə girərək yolla gəlib-gedəni qəflətən güllə ilə vurub öldürür, yaxud yaralayırdılar. Həmin saat, yəni xəbər gələn kimi qubernatorun əmri ilə bir dəstə kazak Abbas bəy Talıb bəy oğlunu götürüb Əsgərana tərəf yollandılar. Kazaklar Abbas bəy Talıb bəy oğlu ilə bərabər, erməniləri həmin səngərlərdən çıxarıb dağıtdılar. Ermənilər isə Əsgəran səngərlərindən çıxarıldıqdan sonra onlar Xanabad kəndinə hücum edirlər. Onlar kənddə Həsənağa Süleyman xan oğlunun mülkünü, böyük və gözəl imarətlərini darmadağın edərək, mal-dövlətini talan etmişlər.

Bundan sonra ermənilər Badara kəndinə hücum çəkirlər. Onlar həkim Mirzə Allahqulu oğlunun evini hər tərəfdən mühasirəyə alaraq od vururlar. Bu zaman Mirzə Allahqulu oğlu öz övladları Cahangir bəy və Kərim bəylə bu əhvalatdan xəbərsiz içəridə işlə məşğul idilər. Ermənilərin bir qismi isə içəri doluşaraq Mirzə Allahqulu oğlunu və övladlarını, eləcə də nökərlərini övrət-uşaqları ilə birlikdə qətlə yetirib mal-dövlətlərini talan etdilər.

## ŞUŞA ŞƏHƏRİNİN ƏTRAFINDAKI KƏNDLƏRDƏ BAŞ VERƏN ƏHVALATLAR

Ermənilərin yuxarıda deyilən vəhşiliklərindən xəbər tutan kürdlər dərhal silahlanaraq bir neçə yüz atlı ilə üz qoydular Minkənd, Xınzirək və başqa kəndlərin üstünə. Onlar bu kəndləri darmadağın etdilər. Ermənilərdən bir qismi öldü, bir qismi qaçıb canını qurtardı, başqa bir qismi isə tüfənglərini atıb təslim oldular.

O günün sabahısı mənim (Mir Möhsün Nəvvabın) yanıma bir cavan kürd oğlanı gəlib xəbər verdi ki, biz müsəlmanlar cəm olub birdən yüz evdən ibarət olan Hərrad kəndinin üstünə hücum çəkdik. Bizim hücumun qarşısında tab gətirməyən ermənilər əlacsız qalıb tüfəng və patrondaşlarını atdılar və acizanə şəkildə təslim oldular. Oğlan dedi ki, indi Qaladərəsinin üstünə hücum çəkmək məqsədi ilə hazırlıq görürük. Həmin oğlan bacardığı qədər boş gilizlər alıb apardı və dedi ki, orada yaxşı patron qayıran var. Verəcəyəm bu gilizləri doldursun, çünki lazım olacaq.

Həmin günlər cənab Şeyxülislam buyurdu ki, erməni tayfasından bir neçə mötəbər adam onun hüzuruna gəlsinlər. Həmin gün müsəlmanlar da oraya toplaşmışdı. Onlar gəldikdən sonra Şeyxülislam buyurdu ki, inşallah, sabah mən

getməliyəm. Yenə də hər iki tayfaya nəsihət edirəm ki, burada əmin-amamlığı pozmayaraq, əvvəlki kimi yenə də biri-birinizə ehtiram ilə yanaşaraq qardaş kimi dolanasınız.

Ermənilərdən biri ayağa durub ərz elədi ki, bu böyüklükdə alovun üstünü pərdə ilə necə örtmək olar? Ermənilərin vaveylası aləmi bürümüşdü. Çox böyük hörmətlə cənablarınızdan xahiş eləyirik ki, getməyəsiniz. Bir-iki gün də burda qalasınız. Bəlkə, bu tayfa arasında sülhü bərqərar eləyəsiniz. Ermənінin bu müraciətindən sonra müsəlman camaatı da cənab şeyxdən xahiş etdilər ki, Qalada bir neçə gün də qalsın. Bu müraciətlərdən sonra şeyx onların xahişini qəbul edərək bir neçə gün yenə şəhərdə qalmalı oldu. Həmin günün sabahı hər iki tayfanın xahişinə əsasən sülhü bərpa etmək məqsədilə hər tərəfdən iyirmi-otuz adamın iştirakı ilə əvvəl erməni kilsəsinə getdilər. Burada alimlər, xəlifə və keşişlər öz dini qanun-qaydaları ilə and içdilər ki, iki millət arasındakı ədavəti qızışdıranların fitvası ilə fitnə-fəsada qoşulmayacaqlar və hər iki tayfa arasında yaradılmış sülhü pozmayacaqlar.

Bundan sonra hər iki firqə birlikdə məscidə gəldilər. Burada xütbələr oxunduqdan sonra cənab qazi müsəlmanları Qur'ani-Şərifə and içdirdi ki, heç kəs bu iki xalq arasındakı əmin-amanlığı pozmayacaq və heç bir fitnə-fəsada bais olmayacaqlar.

Bu andiçmə mərasimindən sonra çox inadkar, nahaq qanlara və fitnə-fəsadlara bais İrəvan əhlindən olan Həmzad adlı bir erməni öz ətrafına onun kimi cəlladları toplayaraq qəfil zəif müsəlman kəndlərinə basqın edirlər. Onlar əvvəlcə kəndin ətrafında olan bir para ot tayalarına od vurub yandırmışdılar. Kənd camaatı bu hücumdan xəbərdar olan kimi kəndin müdafiəsinə qalxaraq düşmənlə vuruş meydanına atılırlar. Ermənilər isə onlardan qorxaraq geri qaçmışlar. Onlar başqa müsəlman kəndlərinə də belə basqınlar edərək xalqın rahatlığına haram qatmışlar. Gah da həmin dəstə Əsgəran bürclərinə girərək gizlicə yoldan gəlib-gedən müsəlmanları namərdliklə vurub öldürürdülər. Öldürdükdən sonra isə qaçıb onun üstündə olan paltarını, pulunu və apardığı malını qarət edib, meyidini yandırırdılar ki, ondan əsər-əlamət qalmasın.

Bundan əvvəl də bu iki tayfa arasında din-məzhəb üstə, yaxud böyük mülklərdən ötrü münaqişə olurdu. Lakin bu cür insafsızlıq və namərdliklər olmurdu. Bu namərd dəstə isə harada əlsiz-ayaqsız adamlar görürdülər, gendən vurub öldürürdülər.

Xaspolad adlı bir müsəlman Qalanın ətrafında yerləşən bir dəyirmanı icarəyə götürmüş və onu bir kişi ilə övrətinə tapşırmışdı. Qarət və qan tökməklə məşğul olan erməni dəstələrinin biri həmin dəyirmana gələrək böyük bir faciə törətmişdilər. Onlar kişini güllə ilə öldürdükdən sonra qucağında dörd aylıq uşaq olan qadına yaxınlaşdılar. Erməni cəlladları onları da öldürmək istəyəndə övrət dedi ki, allah xatirinə məni öldürün, ancaq uşağa əl vurmayın. Ermənilərdən ikisi irəli çıxıb dedilər ki, qorxma, uşağı öldürməyəcəyik. Onlar uşağı qadından alıb

bələyini açdılar. Ermənilərin hərəsi uşağın bir ayağından tutub qüvvətlə hərəsi bir tərəfə çəkdilər. Uşaq iki para oldu. İki yerə bölünmüş uşağın parçalarını ananın üstünə atdılar. Ana bu vəhşiliyə dözə bilməyib huşunu itirdi. Cəlladlar bu qadını da bir neçə güllə ilə qətlə yetirdikdən sonra dəyirmanda olan taxılı və unu, eləcə də malı qarət edib apardılar.

**Ə L A V Ə:** Ermənilərin bu qaniçən dəstələri öldürdükləri müsəlmanlara əvvəlcə olmazın işgəncəsini verərək onların diri-diri burnunu, qulağını, ayağını və kişiliyini kəsdikdən sonra öldürür, cəsədini zibillikdə yandırırdılar.

Yuxarıda qeyd olunan 18 nəfər İran fəhlələrini və erməni məhəllələrində 20-yə qədər alver edən müsəlmanları bu cür vəhşiliklərlə qətlə yetirmişdilər.

**Ə L A V Ə:** Erməni tayfasının müsəlmanlara qarşı olan namərdliklərinə dair çox misallar göstərmək olar. Hacı Bəylərin başına gələn müsibət buna bir misal ola bilər. Belə ki, Hacı Bəylər adlı bir müsəlman sövdəgəri Nikolay adlı bir erməni taciri ilə yaxın dostluq edərlərmiş. Onlar yaxın dost olduqlarından bir-birinə deyərlərmiş ki, hərgah ermənilərlə müsəlmanlar arasında dava olarsa, biri-birimizi onlardan qoruyaq.

Bir dəfə ermənilərlə müsəlmanlar arasında dava başlayarkən Nikolay Hacının dükanında olub. Ermənimin davadan bərk qorxuya düşdüyünü görən Hacı ona ürək-dirək verərək onu gizlin bir yerə aparır. Nikolayı əmin edir ki, orada onu heç kəs tapa bilməz. Dava qurtardıqdan və hər tərəf sakitləşdikdən sonra Hacı Nikolayı hörmətlə öz evinə yola saldı.

Nikolay Hacıya 93 manat pul vermişdi. Bir gün Hacı bu pulları götürüb Nikolaya qaytarmaq üçün onun dükanına gedir. Hacı pulları sayıb erməniyə verdikdən və bir qədər söhbət etdikdən sonra birdən gurhagur düşdü. Hər tərəfdə böyük iğtişaşlar başlandı. Tüfəng və tapança səsləri bazarı bürüdü. Hacı həyəcanlanaraq iğtişaşın səbəbini Nikolaydan soruşarkən o dedi ki, erməni-müsəlman davası düşdü. Hacı ondan soruşur:

— Bəs mən nə edim?

Hacı fikirləşirdi ki, o, erməni Nikolayı gizlədərək qoruduğu kimi yəqin ki, onu da Nikolay ermənilərdən mühafizə edəcəkdi. Lakin təəssüflər olsun ki, belə olmadı. Birdən Nikolay stolun siyirməsindən bir tapança çıxardıb dabanını çəkdi və tapançanı Hacıya tərəf tuşladı. Tapançanın gülləsi Hacının sinəsinə dəyib bir azca yaraladı. Hacı qanı tökülə-tökülə üz qoydu qaçmağa. Nikolay və onunla başqa ermənilər Hacının arxasınca tüfəngdən və tapançadan iyirmiyə qədər güllə atdılar. Amma xoşbəxtlikdən güllələrin heç biri Hacıya dəymədi. Bu əhvalatı Hacı özü mənə danışmışdır. Ermənilərin belə namərdliklərindən və qəddarlığından yazmaqla qurtaran deyil.

**Ə L A V Ə:** Cavad ağa Paşa ağa oğlu adlı bir nəfər müsəlman həmişə ermənilərə hörmət edir, onlara rəhmlə yanaşardı. Çalışardı ki, ermənilərlə müsəlmanlar arasında həmişə sülh olsun. Buna baxmayaraq, yuxarıda adı çəkilən Həmzad adlı erməni cəlladı öz dəstəsilə Cavad ağanın kəndinə basqın etmişdir.

Onlar Cavad ağanın və onun rəiyyətinin evlərinə və gözəl atlar saxlanılan tövlələrinə od vurub yandırmış, mal-dövlətini qarət etmişlər.

**Ə L A V Ə:** Erməni quldur dəstələri Xənəzək kəndinə də basqın etmişdilər. Məmmədağa Ataxan oğlunun bu kənddə gözəl imarətləri və bağları var idi. Erməni quldurları vəhşicəsinə bu imarətləri dağıtmış, bağların ağaclarını doğramış, evdə olan mal-dövləti qarət etmiş və üç yüz qoyununu aparmışlar.

Onun nökərləri qaçıb canlarını xilas etmişlərsə də, çoban onlardan qurtara bilməmişdir. Quldurlar onu vəhşicəsinə öldürmüşlər.

**Ə L A V Ə:** Bu zaman Qalaya bir adam gəlib xəbər gətirdi ki, erməni quldurlarının bu vəhşiliklərinə son qoymaq üçün hər tərəfdən müsəlman atlıları tökülüb ermənilər yaşayan Sissi kəndinə hücum etmişlər. Kənddə müsəlman atlıları erməni quldurlarının bir neçəsini öldürmüş, bəziləri isə qaçıb canını qurtarmışdı. Müsəlman kəndlərindən qarət edilmiş mal-dövlət geri qaytarılmışdır. Kəndə basqın zamanı müsəlman atlıları övrət-uşağa toxunmamışdılar.

Bundan sonra atlılar Məşhər adlı əksəriyyəti erməni olan kəndə tərəf yönəldilər. Ermənilər müsəlman atlılarına müqavimət göstərə bilməyib hərəsi bir tərəfə qaçdı. Onlar bu kənddə olan heyvanları və bəzi əşyaları özləri ilə qənimət götürüb və iqamətgahlarına göndərdilər. Bir para quldur evlərinə və onların ot tayalarına od vurduqdan sonra atlılar Saru kəndinə tərəf yollandılar. Bu kənddə də müsəlmanlar istədiklərini etdikdən sonra Qarabulaq kəndinə üz qoydular. Oradan isə Xəlifə kəndinə getdilər. Bu kəndlərdə də övrət-uşaqlara əl vurmadan quldurlara divan tutaraq aparılan malların hamısını geri qaytardılar.

**Ə L A V Ə:** Yuxarıda haqqında danışdığımız Həmzad adlı erməni qulduru öz dəstəsi ilə yenə gəlib Əsgəran bürclərinə doldular. Onlar bu səngərlərdən namərdcəsinə yolla gəlib-gedən müsəlmanları qəflətən güllə ilə vurub öldürürdülər. Meyidini isə odlayıb yandırırdılar. Həmin gün Mustafa bəy adlı bir nəfər müsəlmanı eləcə öldürdükdən sonra yandırmışdılar. Bu əhvalatdan bir neçə gün sonra, yəni ramazan ayının üçüncü günündə İsa bulağının yaxınlığında meşədə müsəlmanlar üç erməni ilə dalaşırlar. Müsəlmanlar ermənininin ikisini öldürür, üçüncüsü isə qaçır. Arxadan atılan güllələrdən ancaq biri qaçan erməniyə dəyib yaralayır. Yaralanmasına baxmayaraq, qaçıb aradan çıxır və özünü şəhərə yetirir. O, şəhərdə fəryad qoparır ki, nə durmusunuz müsəlman atlıları dörd tərəfdən üstümüzə gəlir, yolda da iki ermənini öldürüblər. Mən isə yaralanıb qaçmışam.

Ermənilər onun bu fəryadını eşidən kimi dükan-bazarı şaraqqa-şuruqla bağlayıb qorxu içərisində Qalaya müvəkkil olan qoşun böyüyünün yanına gəldilər və dedilər ki, müsəlmanlar dörd tərəfdən üstümüzə gəlirlər. İki adamımızı öldürüb, birini isə yaralayıblar.

Qoşun böyüyünün əmri ilə əsgərlər dərpal şeypur çaldılar. Qalada nə qədər ki rus qoşunu var idi, hamısı silahlanıb musiqi çala-çala müsəlman bazarına gəldilər. Gördülər ki, bazarda dükanlar açıq, hər kəs də öz işi ilə, alış-verişi ilə məşğuldur. Davadan heç bir əsər-əlamət yoxdur. Rus əsgərləri yenə musiqi çala-

çala erməni məhəlləsinə qayıtdılar və ermənilərə bildirdilər ki, onlar öz-özlərindən nahaq yerə belə qorxuya düşüblər.

**Ə L A V Ə:** Həmin günün sabahı ermənilərdən on dörd nəfər atlanıb şəhərdən kənarda yerləşən Yarma adlı yerə gəlir və müsəlmanların yolunu kəsir və onların gediş-gəlişinə mane olurlar. Müsəlmanlar əhvalatdan xəbərdar olan kimi bir neçə igid döyüşçü həmin yerə gələrək ermənilərin üstünə hücum edirlər. Ermənilər karıxıb hərəsi bir tərəfə qaçarkən onlardan üçünü öldürüb birini isə yaraladılar. Qaçanlar Qalaya gəlib erməniləri əhvalatdan xəbərdar etdilər. Dərhal qımdatların rəhbərliyi altında bir dəstə erməni Yel dəyirmanı adlanan qayanın üstünə gəldilər. Qayanın üstünə çıxıb durbinlə çay tərəfdən gələn müsəlmanları müşahidə etməyə başladılar. Axşama bir saat qalanda gördülər ki, bir fağır qoca müsəlman kişisi odun yüklənmiş atla gedir. Kişi oruc olduğuna görə atın quyruğundan tutub yavaş-yavaş addımlayırdı. Erməni quldurları qocanı güllə ilə vurub öldürdülər. At isə qaçıb yüklü halda kişinin evinə gəlir. Kişinin külfəti vəziyyəti belə gördükdə qorxuya düşüb tanış-bilişi köməyə çağırdı. Onlar kişini axtarsalar da, artıq gecə düşdüyündən qaranlıqda onu tapa bilmədilər. Səhərisi gün gedib onun meyidini tapdılar və bu haqda divana məlumat verdilər. Sonra isə kəfənə tutub dəfn etdilər. Həmin kişi Səfərəlinin oğlu Qulu dəllək idi. Mərhumun qardaşı hamıya bildirdi ki, ermənilər o biçarəni öldürəndən sonra qarnını yırtıb, başını daşla əzib, qulağını kəsib aparmışdılar. Vay olsun bu növ tayfanın əhvalına ki, Allah-təalanın məxluquna nahaq yerə belə zülmlər edib, dünyanı rahatsız qoyub özlərini də zəlil ediblər.

## ERMƏNİ TAYFASINA NƏSİHƏTLƏR

Əvvəla, bu tayfadan (erməni) sual edirəm ki, bu qədər mərdüməzarlıq və nahəq qanlar tökməkdə, mülklərin və malların talan və tarac edilməsində və yanıb xarabazarlığa çevrilməsində səbəb və mətləbiniz nədən ibarətdir?

Əgər məqsədiniz padşahlıq və kral olmaqdırsa, sizin bu təbiətinizlə və insafsızlığınızla heyhat ağla sığan şey deyil. Ağıllı və kamallı insanın sizin haqqınızda düşüncəsi belədir ki, belə səfeh hərəkətlərlə sizin tayfaya nəinki padşahlıq, heç koxalıq və kəndxudalıq da yaraşmır. Bu, dəfələrlə mötəbər dəlillərlə sübut olunmuşdur.

Birincisi budur ki, Allah-təala zalıma iqtidar və ixtiyar verməz. Əgər pişiyə qanad versəydi, quşların toxumunu yer üzündən kəsərdi. Hərgah dəvəyə və filə qanad versəydi, tamam damlar dağılardı.

İkincisi, özünüzə məlumdur ki, bundan əvvəl erməni tayfası çox idi. İlan kimi çölü yumşaq, içi zəhri-həlahil olduğundan, basdığını kəsdiyindən, mürüvvətsizlikdə həddini keçdiyindən və başqa xalqlara rəhm etmədiyindən, o qədər belə insafsızlıq və zülmkarlıqlarla məşğul olduqlarından hansı millətin əlinə düşürdülərsə, əməllərinizə görə onlara layiqli cəza verirdilər.

**Ə L A V Ə:** Bir mötəbər ziyalı mənə danışdı ki, Almaniyanın dövlət xadimi və alimi mənə dedi ki, ermənilər ki, bu cür yol tutub, çox tezliklə dünyanın üzündən yox olub, onlardan bir əsər-əlamət qalmayacaqdır.

Siz (ermənilər) Allah-təalaya dua edin ki, sizlərə rəhmli və insaflı ürək, xoş niyyət, fitnə-fəsadlardan uzaq, gözəl əməllər qismət edərək, xasiyyətinizi dəyişdirsin və pis əməllərdən çəkindirsin. Bəlkə, bu zaman insanlığa layiq sifətlər əldə edəsiz. Yoxsa siz bu vəhşi təbiət və qəddarlıqla, beş-altı şahı banklara toplamaqla, fəqir-füqəranı aldadıb zorla onlardan beş-üç şahı qopardıb cibinizi doldurmaqla, bığınızı burub başınıza papaq qoymaqla və çiyninizə yapıncı salmaqla padşah olmaq mümkün deyil. Nahaq qanlar töküb namərdliklə qəflətən insan məxluqunu öldürüb, burun-qulağını kəsib, başına nal çalmaqla və başqa növ vəhşiliklə böyük olmaq mümkün deyildir. Belə qəddar və vəhşi adamlar nəinki böyük olmaz, əksinə, o həmişə zəlil və bütün məxluqatın ayaqaltısı olar. Siz xalqınız içərisində əkdiyiniz qəddarlıq toxumunun tezliklə barını görəcəksiniz. Bununla siz başqaları üçün qazdığınız quyuya, yəqin edin ki, özünüz düşəcəksiniz.

Bir ağacın ki, meyvəsi zülm ola,
Bir gün onun gövdəsinə balta çalacaqlar.

**T Ə M S İ L:** Bir dəvəyə sahibi həmişə duz yükləyib gətirib şəhərdə satarmış. Dəvə duz yükü daşımaqdan çox zəifləyirmiş. Bir gün bir tülkü ona deyir ki, əgər yükünün yüngül olmağını istəyirsənsə, sudan gedəndə bir bəhanə ilə çayın içində yat. Gör onda necə olacaqdır. Sabahısı gün dəvənin sahibi yenə ona duz yükləyib şəhərə tərəf yola düşdü. Çaydan keçəndə dəvə bəhanə ilə suyun içində yatdı. Duza su dəydiyindən şəhərə gedənə kimi yarı oldu. Yəni, su ilə əriyib yerə töküldü. Sahibi bunu görcək sabahısı gün dəvəyə keçə və yun yüklədi. Dəvə öz hiyləsindən şadlanırdı. Elə ki, gəldilər çayın kənarına, oradan keçərkən dəvə yenə suda yatdı. Keçə və yun islandıqdan sonra ağırlaşdı. Keçə və yunun ağırlığı on batman idisə, su dəydikdən sonra iyirmi batman oldu. Dəvə yükü apara bilmədiyindən yıxıldı. Sahibi dəvəni o qədər vurdu ki, dəvə axırda öldü.

Qərəz, ermənilərin belə nahaq qanlara bais olmaları, qəddarlığa və mürüvvətsizliyə yol vermələri axırda onların özlərini məhv edəcəkdir. Məgər bunların içərisində idraklı, gələcəyi görən və allahdan qorxanları yoxmudur ki, uzaqgörənlik edib bu fitnə-fəsadlara bais olan və özlərinin xeyrindən ötrü aləmi xəsarətə düçar edənlərə öyüd-nəsihət verib onları düzgün yola qaytaralar. Bircə bunlardan sual edən yoxdur ki, ay ermənilər, vilayətdə alış-verişlə məşğul olduğunuz, zavod və karxanalar işlətdiyiniz, pul və malınız əlinizdə, çoxunuz milyonçu olduğunuz halda və bir kimsənin sizə gözünün üstündə qaşın var demədiyi bir vaxtda Qafqaz vilayətinə saldığınız bu fitnə-fəsadlar nə üçündür?

Padşah və böyüklər yanında hörmətiniz olduğu, sözünüz eşidildiyi və xadimələrlə birlikdə gözəl-gözəl imarətləriniz olduğu və fəhlələr qabağınızda səf-

səf durduğu halda, bu nə tüğyan idi ki, bu vilayətə saldınız? Bir para cibkəsənlərin sözü ilə özünüzü və əhli-əyallarınızı min dürlü bərabər dünya edərək əli qoynunda zar və giryan qoyub, özünüzlə bərabər dünya əhlini də tamam narahat edib, dərdü qəm dəryasına qərq eləmisiniz.

Ayrı-ayrı şəhərlərdə və kəndlərdə ermənilərin bais olduğu fitnə-fəsadlar nəticəsində nahaq qanlar tökülmüş, hesabsız dərəcədə mallar talan və qarət edilmiş, hesabsız sayda imarətlər, dükanlar, karxanalar yandırılaraq viran edilmiş, minlərlə kişilər və övrət-uşaqlar öldürülmüş və yandırılmışdır. Bununla da onlar (ermənilər) hesabsız sayda övrətlərin dul və sahibsiz, uşaqların isə yetim, kimsəsiz qalmasına səbəb olmuşdular.

Qu quşu tükündən tikilən mütəkkələrə baş qoyub söykənməyə naz edənlər, şal və tirmə yorğan-döşəklərdə yatmaq istəməyən şəxslər indi bir köhnə paltonun içində üryan və zaru giryan qalıb. Övrət-uşaqlar, tanınmış adamlar yuvası dağılmış, evləri və imarətləri tar-mar edilərək yandırıldığından tərki-vətən olub, külfətli və külfətsiz başqa vilayətlərə getməyə məcbur olmuş və onlardan bir çoxu səfil həyat keçirməyə məcbur olmuşdur.

Mən bilmirəm fitnə-fəsad törədib xalqı qırğına verən bu erməni quldurları o dünyada sorğu-sual zamanı adil Allaha nə cavab verəcəklər.

Bu qədər zülm, sitəmkarlıq, insafsızlıq və özbaşınalıqla bu əyalətdə bayrağınızı qaldırmaq istəyirsiniz. Lakin ona nail olmayacaqsınız. Bəli, o padşahlıq bayrağı ucalarsa, əvvəl onun altına başı-gözü mismarlanmış, burnu-qulağı kəsilmiş, başları daş və çəkiclə əzilmiş, bədənləri zülm odu ilə odlandırılmış şəxslərin övladları gəlib sizdən sorğu—sual edəcəkdir. Bunu yəqin bilin ki, bu zülmlərin əvəzi çox tezliklə onu törədənlərdən çıxılacaq. Allah-təala da bu zülmləri törədənlərə rəhm etməyəcəkdir. Əlbəttə, bu zülmləri edən quldurlardan tezliklə bu dünyada qisas alınacaq və axirətdə də onun cəzasını çəkəcəklər.

## İBRƏTAMİZ ƏHVALAT

Bir gün mən (M. M. Nəvvab) bazardan keçərkən gördüm ki, xalq yığışıb nəyəsə tamaşa edirlər. Yaxınlaşıb baxanda gördüm ki, Əbdül adlı bir kişi tələ ilə üç-dörd siçan tutub, yanına da bir şüşə neft qoyub, siçanların üstünə neft tökərək bir—bir yandırıb buraxırdı. Siçan od tutan kimi bərk qaçmağa başlayır və o daha da alovlanırdı. Bir az o yan-bu yana qaçdıqdan sonra yıxılıb yanırdı. Mən bunu görəndə əsəbiləşib o kişiyə dedim ki, ay kişi, bu nə insafsız işdir ki, sən tutursan? Allahın məxluquna zülm edərək od vurub yandırırsan. Belə iş etmə ki, Allah-təalaya xoş gəlməz. Və bu zülmlərin cəzasını tezliklə verər. Siçanları yandıran kişi mənə dedi ki, onlar mənim torbamı deşib zərər vurublar. Mən də gərək əvəzində bunları yandıram. Bundan sonra mən Əbdül kişidən ayrılıb evimə getdim.

Bu əhvalatdan bir neçə gün keçdikdən sonra siçanları yandıran Əbdül kişi bir şəxsə barıt satdığı zaman manqaldan bir qığılcım barıt torbasına düşür. Bir

batmana qədər barıta od düşən kimi gurultu ilə böyük partlayış olub, dükandakı bütün malların hamısını havaya sovurur. Bu partlayışdan Əbdülün özü də od tutaraq siçanlar qaça-qaça yandığı kimi, o da qaça-qaça yanıb həlak oldu. Onunla bərabər, iki nəfər də yanmışdı. Lakin onları ölümdən xilas etmək mümkün oldu. Əbdül kişinin həm özü öldü, həm də dükanı ilə bütün malları yanıb məhv oldu.

Qərəz, bu nəsihətamiz sözlərdən məqsəd odur ki, bəlkə, erməni tayfasının bir-iki nəfərinin qəlbinə insaf nuru yol tapa, şeytan əməllərinə qulluq edən kəslərə nəsihət verib, onları tutduqları qeyri-bəşəri əməllərdən çəkindirə. Bəlkə, bundan sonra gördükləri bu əməllərin peşmançılığını çəkməyələr.

## HİCRİ 1323-cü (MİLADİ 1905-ci İL) TARİXDƏ TİFLİSDƏ BAŞ VERƏN ƏHVALATLAR HAQQINDA

Oktyabr ayında Tiflis şəhərində bayram münasibəti ilə camaat küçələrə gəzintiyə çıxmışdı. Camaat kilsənin yanına çatanda birdən evlərin pəncərələrindən güllələr yağmağa başladı. Neçə adam bunun nəticəsində öldü və yaralandı.

Camaat erməni «Listok» qəzetxanasının yanına çatanda qəzetxananın otağından camaatın içərisinə bir bomba atdılar. Bundan başqa, gimnaziya tərəfdən də bir bomba atıldı. Camaat «Sobraniye» binasının yanından keçəndə bir bomba da oradan atdılar.

Bu zaman üç rota rus qoşun dəstələri gəldi və başladı camaatla atışmağa. Bomba atılan evləri gülləbaran etdilər. Nəticədə otuz beş nəfər həlak oldu, on beş nəfər yaralandı.

**Ə L A V Ə:** Bu hadisələr cərəyan edən vaxt Batum tərəfdə neçə körpü partladıldı. Qoridə isə qoşunun toqquşması oldu.

Uzerget uyezdində isə camaat rus kazaklarının üstünə bombalar atdılar. Nəticədə çoxlu kazaklar məhv oldu və yaralandı.

Yuxarıda qeyd etdiyimiz hadisədən sonra Tiflis şəhərində yenidən dalbadal baş vermiş atışmalar zamanı otuz dörd nəfər həlak oldu, səksən bir nəfər yaralandı.

## TİFLİS ŞƏHƏRİNDƏ ERMƏNİ-MÜSƏLMAN DAVASI

Dekabr ayında erməni tayfası yenə dinc dura bilməyib, hazırlıq gördükdən sonra qəflətən müsəlmanların üstünə hücum çəkdilər. Müsəlmanların bu hücumdan xəbərləri olmadığından ermənilərə layiqli cavab vermək üçün yanlarında silah və sursat yox idi. Əhvalatdan xəbərdar olan gürcülər tüfəng və patronla müsəlmanlara kömək etdilər. Müsəlmanlar tanınmış bir şəxsin imarətinə girərək evi özləri üçün səngərə çevirdilər və ermənilərlə atışmağa başladılar. Müsəlmanlar iki gecə-gündüz ermənilərlə atışdılar.

Tiflisdə baş verən bu əhvalatdan ətraf müsəlman kəndlərinin camaatı xəbərdar olan kimi min atlı cəm olub müsəlmanların köməyinə gəldilər. Namestnik

kəndlərdən gələn köməkdən xəbərdar olub əmr verdi ki, atla şəhərə girmək qadağan olunsun. Odur ki, müsəlmanlar şəhərin ətrafından atlarını geri - kəndlərə qaytararaq özləri piyada Tiflis şəhərinə daxil oldular. Onlar salavat və nərə çəkərək ermənilərin üzərinə hücuma başladılar. Bir gecə-gündüz vuruşmadan sonra çoxlu erməni qırıldı. Qalanları isə qaçıb aradan çıxdılar.

## 1905-ci İLİN OKTYABR AYINDA BAKIDA BAŞ VERƏN ƏHVALAT

Padşahın şadlıq günündə rus və müsəlman camaatı «ura» deyə-deyə küçələri dolanır və türk dillərində şüarlar oxuya-oxuya küçələri dolanırdılar. Ruslar öz qırmızı bayraqlarını qoyub imperatorun şəkli ilə öz milli bayraqlarını götürüb dolanırdılar. Müsəlmanlar da onlara qarışıq qubernatorla birlikdə Böyük kilsəyə gəlib dualar oxudular. Bundan sonra isə qubernator baş keşişlə birlikdə «Qasım bəy» məscidinə gəldilər. Orada da dualar oxudular. Bu vaxt bərk yağış yağdığından camaat dağıldı. Bir dəstə kilsənin qabağından keçərkən gördülər ki, bir rus əlində qırmızı bayraq hündür bir yerə çıxaraq hökumətə qarşı nitq söyləyir. Camaat tökülüb onu tutdular və sonra döyüb öldürdülər. Divan da buna mane olmadı.

Yenə də 20 oktyabrda dövlətin ziddinə gedən camaat cəm olub istədilər ki, həbsxananı açaraq məhbusları azad etsinlər. Rus qoşunu bunun qarşısını aldı. Toqquşma nəticəsində camaatdan on səkkiz nəfər yaralandı. Həmin gün Bibi-Heybət yolunda qırmızı bayraq qaldıranlarla milli bayraq daşıyanlar arasında bərk vuruşma və atışma oldu. Nəticədə bir adam öldü, iki nəfər isə yaralandı. Həmin hadisə haqqında erməni qəzetləri yazırdı ki, bu toqquşmada yüz nəfər erməni ölüb.

21 oktyabrda bir dəstə rus kazakları öz əziz günləri münasibətilə əllərində padşahın şəkli küçə ilə hərəkət edirdilər. Ruslar Mirzəyans adlı varlı və mənsəb sahibi ermənininin evinin qabağından keçəndə həmin evdən kazakların üstünə güllə atdılar. Həmin saat kazaklar evi mühasirəyə aldılar və hər tərəfdən neft töküb odladılar. Ev yanıb külə döndü. Kazaklar yanğın söndürən müvəkkilləri də evi söndürməyə qoymadılar. Ev alışıb yanarkən yel vurub qonşu erməni evlərinə də od saldı. Bunun nəticəsində də bütün evlər yandı.

Həmin əhvalatdan sonra rus kazak dəstəsi ermənilərin dükanlarına hücum çəkərək talan və tarac etdilər. Sonra isə kazaklar erməni varlıları olan Lalayevin, Kələntərovun dükanlarının əmlakını, eləcə də Tağızadənin dükanlarını icarəyə götürmüş ermənilərin mallarını və əşyalarını talan etdilər. Bu toqquşmada ölənlərin və yaralananların sayı qırx nəfərə çatmışdı. Onun da əksəriyyəti erməni idi. Bu əhvalatdan sonra qubernatorun əmri ilə rus kazakları erməni küçələrindən köçürülərək müsəlman məhəllələrində yerləşdirildi.

Oktyabrın 23-də ruslar qubernatorun iqamətgahında məsləhət toplantısı keçirirdilər. Bu toplantıda ermənilərdən başqa, bütün millətlərin nümayəndələri iştirak edirdilər. Toplantıya ermənilər özləri gəlməmişdilər. Məsləhətdən sonra

kazaklar gəlib qubernatordan erməniləri cəzalandırmağa icazə verməsini xahiş etdilər. Qubernator onları sakitləşdirdi. Bir az keçdikdən sonra yenə bir dəstə kazak padşahın övrətinin şəklini millət bayrağı ilə birlikdə əllərinə götürüb küçə-bazarı gəzməyə çıxdılar. Onlar erməni məhəlləsinə gəlib çatanda yenə onların üstünə evlərin birindən güllə atdılar. Güllə atılan ev erməni tərəfindən icarəyə götürülmüş müsəlman evi idi. Dərhal kazaklar həmin evi gülləbaran edərək ermənilərin evlərini yandırmağa başladılar. Bu hadisədə öldürülənlərin və yananların sayı on altı nəfər olmuşdu. Yaralananların miqdarı isə məlum deyildi. Yenə həmin günün gecəsi atışmalar oldu. Bir erməni evi yandırıldı.

Oktyabr ayında baş vermiş toqquşmalarda əlli yeddi nəfər adam öldürülmüşdür ki, bunlardan əlli biri erməni, biri rus, biri gürcü, biri yəhudi, ikisi isə müsəlman idi. Yaralananların sayı isə 59 nəfər idi. Onlardan 38 nəfəri erməni, 14-ü rus, biri yəhudi, biri nemes, 4 nəfəri müsəlman və biri nə millət olduğu məlum olmadı. Yandırılmış evlərin miqdarı isə 28 ədəd idi. Onlardan 24-ü erməni, biri rus, biri isə müsəlman evi idi. Bunlarla yanaşı, iki şəhər budkası da yandırılmışdı. İğtişaşlar zamanı dəyən zərərin miqdarı məlum olmamışdır. Bu iğtişaşa və xəsarətə erməni tayfası bais olmuşdur.

## RAMAZAN AYINDA (15 noyabr) ŞUŞA ŞƏHƏRİNDƏ BAŞ VERMİŞ ƏHVALAT

Məsumovlardan olan bir erməni öldürülmüşdü. Ermənilər bu ölüm hadisəsinin izini qəsdən gətirib müsəlman bazarına çıxardılar və onu müsəlmanlar öldürdüyünü söylədilər. Odur ki, divan əhli müsəlmanlar arasında axtarış aparmağa başladı. Müsəlmanlar bildirdilər ki, biz heç vaxt belə namərdliyə yol vermərik. Bunu ermənilərin özləri edib bizim üstümüzə yıxırlar ki, müsəlmanları müqəssir etsinlər.

Xülasə, çox çəkişmələrdən sonra ermənilərin sakitləşdirilməsindən ötrü divan bir dəstə atlı kazak və bir dəstə piyada götürüb qubernatorla birlikdə müsəlman meydanına gəldilər. Qubernator bir kağız oxuyaraq bildirdi ki, sərdarın hökmünə əsasən gərək ölən ermənininin meyidini verəsiniz. Əgər onun meyidi verilməsə bu Şeytanbazar adlanan dükanlardan gərək bir neçə yüz manat pul toplayıb o ölən ermənininin külfətinə verəsiniz.

Bir-iki gündən sonra rus qoşunu yenə gəlib o qərarla müsəlman bazarından keçdi. Qubernator müsəlmanlarla yumşaq rəftar edirdi, cənab qazi və əyanlarla xoş davranırdı.

Ramazan ayının 18-ci günü qubernator belə məsləhət gördü ki, müsəlman əhli dükan-bazarı bağlayıb toy və musiqi çala-çala padşahın fərmanı oxunacaq böyük bir yerə gəlsinlər. Müsəlmanlar cavab verdilər ki, bu günlər bizim əziz və təziyə günlərimizdir. Odur ki, musiqi və toy çalmaq olmaz. Özümüz isə toplaşıb oraya gələ bilərik. Danışığa əsasən müsəlmanlar dükan-bazarı bağlayıb böyük bir

izdihamla, şahın iki şəkli və on bayraq əllərində bazardan keçərək divanxananın qabağına gəldilər və əyanlar da gəlib bağda qərar tutdular. Qubernator böyük çinovniklərlə müsəlmanların toplaşdığı yerə gəldilər. Kilsənin ətrafı kiçik olduğundan qubernator alimlər və əyanlarla birlikdə su anbarının üstünə gəldilər. Bura həm də hündür idi. Camaat isə əllərində bayraqlar və padşahın şəkilləri anbarın qabaq tərəfinə yığışdılar. Hər tərəf camaatla dolu idi. Camaatın gurultusundan qulaq tutulurdu. Bir atlı kazak dəstəsi gəlib bir tərəfdə səf çəkib durmuşdu. Bu qədər camaatın içində vur-tut beş nəfər erməni var idi. Onlardan biri qubernatorun yanında, dörd nəfəri isə kilsənin qabağında dayanmışdı. Onların birisinin adı Amrimov Mikit idi. Mən onu yanıma çağırıb dedim:

— Baron Mikit! Bu nə fitnə-fəsad, xəsarət və mərdüməzarlıqdır ki, erməni tayfası dünyaya salıb? Xalqın rahatlığını kəsiblər. Onlar bu qədər tökülən nahaq qanlara, yanan mülklərə və qarət edilən mallara bais oldular.

Mikit cavab verdi ki, Allah-təala belə işlərə bais olan kəslərə və cahil nadanlara qənim olsun. Biz özümüz də mat qalmışıq, bilmirik nə çarə edək. Abrımız töküldü, etibarımız kəsildi, mal və mülkümüz isə yandırıldı və talan edildi.

Qubernator cibindən bir kağız çıxardaraq bildirdi ki, bu, əlahəzrət imperatorun fərmanıdır. Sonra qubernator həmin fərmanı hündür səslə oxumağa başladı. Tərcüməçi isə camaatı başa saldı ki, padşahımız bir neçə işdə bizə hürriyyət, yəni, azadlıq iltifat edibdir:

1. Əvvəla, milli və şəri məsələlər üzrə məsləhətləşmələr aparmaq üçün yığıncaqlar azaddır. Bunun üçün icazə lazım deyil.

2. Söz azadlığı. Yəni, özünə və millətinə əhəmiyyətli və xeyirli hesab etdiyin məsələləri danışmağa, yazmağa və çap etdirməyə icazə verilir.

3. Vicdan azadlığı. Yəni, istədiyin dinə və məzhəbə qulluq etmək.

4. Mal və can təhlükəsizliyi. Yəni, milyonlarca malın və mülkün olsa da, bir kəs heç bir haqla ona toxuna bilməz.

Elə ki, fərman oxunub qurtardı, qubernator əlini yuxarı qaldırdı. Camaat da ona baxaraq əllərini və papaqlarını yuxarı qaldırdılar və sevinclə «Ura» çəkdilər. Ondan sonra cənab uçitel Mirhaşım bəy Vəzirzadə nitq etdikdən sonra cənab axund Hacı molla Hüseyn Qazi hündür səslə bir dua oxudu. Dua başa çatan kimi Ağa Mirhaşım bəy hürriyyət manifestinin elan edilməsi münasibəti ilə şəhərin fağır-füqərasına paylamaq üçün yüz manat pul verdi. Onun ardınca da əldi manat cənab qubernator iltifat etdi. Bir sıra əyanlar da bu xeyriyyə işinə qoşuldular. Bununla da bu təntənəli yığıncaq başa çatdı.

Bu yığıncaqdan iki gün sonra müsəlmanlarla erməniləri barışdırmaq üçün qubernator müşavirə çağırdı. Müşavirədə hər iki tərəfdən nümayəndələr çıxış edərək öz fikirlərini söylədilər və barışıq elan etdilər. Həmin günün səhərisi qubernator Gəncə şəhərinə getməyə hazırlaşırdı. Yüz nəfərəcən müsəlman cavanlarından atlılar silahlanmış halda qubernatorun faytonunu evdən müşayiət

edərək qərargaha gəldilər. Bu zaman bir neçə erməni qərargaha gəlib müsəlmanlardan şikayət etdilər. Qubernator qəzəblə onlara baxıb acıqlı dedi:

— Artıq mənə məlum olubdur ki, siz erməni tayfasının müsəlmanlar haqqında mənə dedikləriniz bütün hamısı yalan və böhtandır. Bu şikayətlər bütünlüklə qərəzçilik və düşmənçilik məqsədi güdür.

Qubernator ermənilərin cavabını verdikdən sonra müsəlman atlılarının müşayiəti ilə yola düşdü. Xan bağından bir az o tərəfə getdikdən sonra faytonu saxlatdırıb müsəlman atlılarına artıq dərəcədə iltifatla razılıq edib, onların geri dönməsini məsləhət bildi. Atlılar qubernatorla xudahafizləşib geri döndülər. Atlılar gurultu ilə şəhərə daxil olarkən ermənilər vəhşətə düşdülər. Onlar belə xəyal etdilər ki, bu atlı müsəlmanlar erməni-müsəlman davasını təzələmək üçün kəndlərdən cəm olub davaya gəliblər. Mətləb aydın olandan sonra ermənilər sakitləşdilər.

Fitrə bayramı günü bütün alimlər, seyidlər və əyanlar məscidə toplaşıb ermənilərlə davada məzlum və şəhid olanlar üçün təziyə tutub Quran oxuyurdular. Bu zaman erməni xəlifəsi bir neçə keşiş və camaatın nümayəndələri ilə məscidə gəlib müsəlmanların bayramını təbrik etdilər, sülh və əmin-amanlıq yaratmaq üçün camaatla görüşüb qayıtdılar.

**ƏLAVƏ:** Şəvval ayının səkkizinci günü belə bir xəbər yayıldı ki, Dilicanda yol gələrkən Qərvənd tərəfdə dörd erməni öldürülüb. Odur ki, təhqiqat aparmaq üçün bir neçə müsəlmanı yoldan geri qaytarmışdılar. Bu deyilən əhvalat baş verən gün ermənilər Yel dəyirmanı deyilən qayanın üstündən, aşağı yolla odun gətirən Xəlfəli bir müsəlmanı güllə ilə vurub, ölümcül yaralamışdılar. Müsəlmanlar onu gətirib Qalada öz xəstəxanalarına qoyduqdan sonra divana hadisə ilə bağlı məlumat vermişdilər.

**Ə L A V Ə:** Kərbəlayı Məhəmməd adlı bir yaxşı papaqçı var idi. O, tikdiyi papaqların bir qismini aparıb erməni bazarında satardı. Ermənilərin namərdliklərindən yaxşı hali olan adamlar Kərbəlayı Məhəmmədi erməni bazarına getməkdən çəkindirməyə çalışırdılar. Mən özüm (M. M. Nəvvab) iki dəfə onun erməni bazarına papaq apardığını görüb, məzəmmət etmiş və erməni bazarından əl çəkməsini ona təkrar-təkrar demişdim. Bu məsləhətləri qulaqardına vuran Kərbəlayı Məhəmməd həmin günün axşamı, yəni şəvval ayının 8-ci günü bir neçə papaq götürüb satmaq üçün yenə erməni bazarına gedir. Ermənilər onu bir hiylə ilə daldaya çəkib öldürmüş, cəsədini isə gizlətmişdilər.

**Ə L A V Ə:** Yenə həmin gün ermənilərə xəbər gəldi ki, Turşsuyun yolunda müsəlmanlar iki erməni öldürüb, başlarını kəsiblər. Bu xəbəri eşidən kimi, bir dəstə erməni cavanları silahlanaraq fəryad çəkə-çəkə ermənilər öldürülən tərəfə yollandılar. Bazarda alış-verişlə məşğul olan ermənilər bu fəryadı eşidən kimi həyəcanlı şəkildə dükanlarını bağlayıb, meydana yığıldılar. Hər tərəfdən müxtəlif çağırış və haray səsləri gəlirdi. Rus tayfasından olan bir nəfər bu vəziyyəti görən kimi qaçıb divanxananın qabağına gəldi. Burada o, müsəlmanlara xəbər verdi ki, nə durmusunuz, ermənilər davaya hazırlaşırlar, bu saat sizin üzərinizə hücuma

başlayacaqlar. Bu xəbəri müsəlmanlara çatdırdıqdan sonra həmin rus qoşun hazır olmaq üçün zəng çaldı.

Bu xəbəri eşidən müsəlmanlar dükanlarını bağlayıb silahlandıqdan sonra, səngərlərə qaçdılar və davaya hazır vəziyyət aldılar.

Ermənilər də kilsələrin damında, evlərdə və küçələrdə hazırladıqları səngərlərə doluşmuşdular.

Divan əhli əhvalatdan xəbərdar olan kimi bir dəstə əsgər götürüb, musiqi çala-çala erməni məhəllələrindən keçərək müsəlman məhəlləsindən bazara gəldilər. Camaat əhvalatdan xəbərdar olan kimi sakitləşərək hərə öz yerinə qayıtdı.

## GƏNCƏ ŞƏHƏRİNDƏ MÜSƏLMANLARLA ERMƏNİLƏR ARASINDA BAŞ VERMİŞ ƏHVALAT

### «8 ŞƏVVAL 1323-cü il (MİLADİ 1905-ci il)

Şəvvalın 8-də xəbər gəldi ki, Gəncə şəhərində müsəlmanlarla ermənilər arasında olan toqquşma nəticəsində dava başlamışdır. Teleqrafla xəbər verdilər ki, iki gecədir ki, Gəncədə böyük od-alov görünür. Ancaq təfsilatı məlum deyildir. Sonrakı təhqiqatla məlum oldu ki, erməni tayfası müsəlmanları arxayın edərək onlara qarşı yeni xəyanət hazırlamaq üçün tədarük görərək hər yana yazıb özləri üçün köməklər gətirmişlər.

Müsəlmanlar isə hər şeydən xəbərsiz sakit və samit öz işlərində və alış-verişlərində idilər.

Ermənilər silah tədarüklərini məramlarınca yığdıqdan sonra hər yana yazıb qüvvə tələb etdilər. Bu tələb əsnasında hər yandan silahlı ermənilər gəlirdi. Gəncə ermənilərinə Qarabağdan da kömək gəlmişdi. Qarabağdan gələn dəstənin başında dülgər Barseğin oğlu Sancan dururmuş. Ermənilər müsəlmanlarla davanı başlamaq üçün nahaq yerə üç müsəlmanı öldürürlər. Müsəlmanlar bu əhvalatı eşidən kimi bazar-dükanı bağlayıb silahlanır və «Ya Allah!» deyib ermənilərin üstünə hücum çəkərək atışmağa başlayırlar. Bu xəbər ətrafa yayılan kimi kənar yerlərdən köməklər gəldi. Bu gələn köməklərin arasında Əli adlı mütəəssib və qeyrətli bir cavan var idi. Qaçaq olan bu oğlan başına bir xeyli atlı toplayıb Gəncəyə müsəlmanların köməyinə gəlmişdi. Ermənilərin qaçmasına imkan verməmək üçün qabaqcadan körpünü kəsdilər. Bundan sonra ermənilərin üstünə güllə yağdırmağa başladılar. Ermənilərdən qırılan çox oldu. Ermənilərin mövqeyi tutulduqca onların evlərinə, dükanlarına və mağazalarına od vurub yandırırdılar. Amma bir işdə çox səhv etdilər ki, müsəlman məhəlləsində yerləşən və məscid dükanına bitişik olan erməni dükanına od vurdular. Çünki erməni dükanı yanarkən küləyin təsiri ilə od-alov məscid dükanına da keçdi. Söndürülməsi mümkün olmadığından erməni dükanı ilə məscidin mağazası da yandı.

Bu dava nəticəsində ermənilərdən xeyli adam qətlə yetirildi. Dedilər ki, Qarabağdan gəlmiş Barseğin oğlu Sancan da öldürülmüşdür. Amma sonra məlum oldu ki, diridir. Müsəlmanlardan da bir neçə nəfər şəhid olmuşdu.

Neçə vaxtdan sonra xəbər çıxdı ki, Mahəmmədhəsən adlı bir molla iki nəfərlə nəyəsə baxmağa gediblərmiş. Hiyləgər erməni tayfası onları şirin dilə tutaraq harasa aparıb yox etmişdilər. Sonra onların taleyindən bir xəbər çıxmadı.

## QALA ƏHVALATI

Şəvval ayının 9-cu günündə ermənilər yenə Yel dəyirmanı adlanan qayanın üstündən aşağı enib, aşağıda qayaların arxasında gizlənirlər. Bu zaman üç nəfər müsəlman qabaqlarında da odun yüklənmiş ulaqları danışa-danışa oradan keçərkən həmin qayaların arxasında gizlənən ermənilər daşların arxasından çıxıb onları gülləyə tutdular. Məmiş adlı qalalıya güllə dəyən kimi həlak oldu. O birisi isə qolundan yaralandı. Üçüncü odunçu isə salamat, erməniləri söyə-söyə qaçıb Qalaya xəbər gətirdi. Xalq gedib həmin yaralını gətirib xəstəxanaya qoydular. Həlak olanı isə dəfn etdilər. Bundan sonra baş vermiş əhvalat haqqında divana xəbər verdilər. Həmin günü müsəlmanlar da enib yolda dörd nəfər erməni öldürdülər. Onlardan biri daşaltılı, üçü isə Şuşakənddən idi.

Bu vaxt xəbər gətirdilər ki, aşağı Bağlarda səkkiz yüz müsəlman atlısı cəm olmuşdur. Lakin onların məqsədləri heç kəsə məlum deyildi. Heç kəs bilmirdi ki, onlar Qalaya gələcəklər, yoxsa erməni kəndlərinə hücum edəcəklər.

Qaladakı erməni tayfası bu xəbəri eşidən kimi təşvişə düşdülər və vəhşətlə divan böyüklərini görüb xahiş etdilər ki, gərək biz müsəlmanlarla yenidən sülh bağlayaq. Bundan sonra divan böyükləri bir dəstə rus əsgəri götürüb musiqi çala-çala erməni nümayəndələri və keşişləri ilə müsəlman bazarına gəldilər. Cənab qazi və cənab Əbdürrəhman ağa da xeyli müsəlmanlarla onların yanına gəldilər. Həsənəli bəy orada iki xalq arasında əmin-amanlığın qorunub-saxlanması naminə bir nitq söylədi. Erməni keşişi də çıxış etdikdən sonra hər iki xalqın nümayəndələri divan böyükləri ilə birlikdə erməni bazarına gəldilər. Erməni bazarındakı toplantıda isə keşiş və Haşım bəy nitq söylədilər. Haşım bəy ermənilərə xitab edərək dedi:

— Ey camaat, bu nə fitnə-fəsaddır salmısınız iki millət arasında? Bu qədər məxluqatın dincliyini kəsmişsiniz. Əgər bu işlərlə məqsədiniz sosialistlikdirsə, onların qaydaları belə deyil. Bir məqsəd və səbəb olmaya-olmaya nə üçün bu qədər nahaq qanlara bais olub, uşaqları yetim, övrətləri dul, gözü yaşlı qoyursunuz. Onların ahu-naləsinin göyə yüksəlməsinə razı olursunuz? Əgər könlünüz dava istəyirsə və özünüzü igid hesab edirsinizsə, onda gərək övrətlər kimi daşların dalında və evlərdə gizlənib qəflətən yolla gəlib-gedəni namərdcəsinə vurmayasınız və sinənizə döyüb özünüzü qəhrəman kimi aparmayasınız. Davanın qaydası belədir ki, siz də, müsəlmanlar da çıxalar bir düz yerə, üzbəüz tüfənglə, yaxud qılıncla,

yaxud xəncərlə mərdi-mərdanə bir-birinizlə vuruşasınız. Ya siz müsəlmanlara qalib gələrsiz, ya da müsəlmanlar sizin nəslinizi bu şəhərdən yox edər. Bununla da bütün məxluqatın canı dincələr. Məgər xudavəndi-aləmdən qorxmursunuz, adlarını qımdat qoymuş bir neçə erməni quldurlarının həftədə bir çaxırın kefi başlarına vurarkən iki millət arasına fitnə-fəsad salıb, nahaq qanlara bais olurlar. Sizlər də onların sözlərinə baxıb, özünüzü təhlükəyə salırsınız. Bunun nəticəsində də nə qədər adamlarınız və mallarınız tələf olur, mülkləriniz yandırılıb xarabalığa çevrilir. Özünüz görürsünüz ki, dava vaxtı 10 nəfər müsəlmandan öləndə min nəfər sizdən tələf olur. Quldurların sözünə qulaq asmayın. Allah-təalanın yoluna qayıdın.

Haşım bəydən sonra cənab Əbdürrəhman ağa və cənab qazi xütbələrdə fatihə oxudular.

Bu barışıq günü yuxarıda haqqında danışdığımız əhvalat zamanı öldürülmüş müsəlmanların qatilini gətirib divana təhvil verdilər. Onlar iki nəfər idilər. Onlardan biri Qaybalı kəndlisi erməni dəmirçi Mirzə idi. Divan hər ikisini həbsxanaya göndərdi.

## SEYİDİN ƏHVALATI

Həmin gün ermənilərlə müsəlmanların barışığı elan edilərək hər iki millət arasında sülh yaradıldıqdan sonra kəndistan yerindən olan və orada alverlə məşğul olan bir seyid evlərinə tərəf gedirdi. Seyid erməni küçəsi ilə bulvarın yanından gəlib keçəndə onunla tanış olan bir erməni qabağına çıxdı. Hal-əhval etdikdən sonra erməni dedi ki, bu evdə satılmalı bir palaz var. Gedək onu sənə alım. Bu şərtlə ki, əgər ucuz alsam, mənə dəllallıq pulu verməlisən. Seyid onunla razılaşdı. Onlar bir az getdikdən sonra qabaqlarına iki yapıncılı qımdat çıxdı. Onlar ermənicə bir-birindən soruşdular ki, seyidi harada aparıb öldürsünlər. Birisi dedi ki, əvvəl gərək Kiki Kələntərova deyək, ondan sonra öldürək. Seyid erməni dilini bildiyindən bu danışıqların hamısını başa düşürdü. Əhvalatın nə yerdə olduğunu dərk edən seyid daxilən həyəcanlansa da, öz həyəcanını büruzə vermədi. Əvvəl istədi ki, qaçsın, lakin buna heç bir fürsət olmadığını görüb vəziyyətdən çıxış yolu axtarmağa başladı. Ermənilərdən biri digərinə dedi ki, siz onu söhbətə tutub saxlayın, mən gedim Kikiyə məlumat verim. Bir azdan erməni geri dönərək öz yoldaşlarına buyurdu ki, seyidi Kikinin əmri ilə öldürüb onu da papaqçını basdırdığınız yerdə basdırın. Bundan sonra onların hər üçü üzərinə hücum çəkib qollarını tutdular və toqqanı açıb boynuna bağlayıb çəkə-çəkə bir həyətə gətirdilər. Evdən bir övrət çıxıb dad-fəryad elədi ki, bunu burda öldürməyin. O gün papaqçını öldürərkən uşağım qorxaraq naxoşlayıb. Övrətin etirazından sonra onlar seyidi evdən çıxartdılar. Övrət isə darvazanı onların arxasınca bərk-bərk bağladı. Ermənilər seyidi evdən çıxardıqdan sonra fikirləşdilər ki, onu harada öldürsünlər. Bu zaman birdən yolun o biri tərəfindən hay-küy qalxdı. Bir müsəlman çığırırdı ki, tut məni görüm necə tutursan. Kəndistan yerindən olan bu müsəlman atın üstündə

getdiyi yerdə iki erməni onun üstünə hücum çəkərək tutub öldürmək istəsələr də, gücləri çatmır. Bu seyidin yanında olan ermənilərdən biri onunla qaldı, ikisi isə o biri ermənilərə köməyə getdilər. O biri erməni seyidi orada olan çuxura salmaq istəyərkən, seyid toqqadan tutub erməniyə müqavimət göstərir. Yer yaş olduğundan seyidin göstərdiyi müqavimət nəticəsində ermənının ayağı sürüşüb yıxılır və toqqa əlindən çıxır. Seyid fürsəti əldən verməyib erməni qalxanacan müsəlman məhəlləsinə tərəf xeyli qaçdı. Qaçarkən yolda seyid bir neçə dəfə yıxılsa da, qalxıb yenə də, öz yoluna davam edirdi. Nəhayət, müsəlman məhəlləsinə çatdıqdan sonra sakitləşdi.

**Ə L A V Ə:** O günün sabahısı erməni qəbristanlığında bir erməni öldürdülər. Ermənilər əhvalatdan xəbərdar olan kimi gedib divana şikayət etdilər. Divan isə cənab qazinin yanına gələrək ona bildirdi ki, ermənilər qatili tələb edirlər. Qazi ərz etdi ki, sizinlə gəldiyimiz razılaşmaya əsasən biz ancaq şəhərdə baş verən hadisələrə cavabdeh olacağıq. Şəhərdən kənarda baş verən hadisələrə isə biz müdaxilə etməyəcəyik. Çünki bu ölüm hadisələrinin əksəriyyətini ermənilər özləri eləyib, müsəlmanların üstünə böhtan atırlar. Odur ki, bunların heç birinin müsəlmanlara dəxli yoxdur.

**ƏLAVƏ:** Şəvval ayının 12-də Qalaya vətənpərvər şəxslərdən bir məktub gəldi. Məktubda qeyd edilirdi ki, yollar çox qorxulu olduğuna görə müsəlmanlar bu tərəfə səfər etməsinlər. Həmin gün Bağlar tərəfdən gələn cənab Haşım Vəzirzadə nəslindən olan Cəfər bəyin sərkərdəliyi ilə bir neçə yüz atlı və piyada gəlib erməni kəndlərini mühasirəyə aldılar. Digər tərəfdən isə Piçənis və başqa kəndlərin kürdlərindən də yüzə yaxın atlı və piyada gəlib erməni kəndlərini mühasirəyə aldılar. Xəlifəli tayfasından olan müsəlmanlar kürdlərlə danışıq apararaq bu nəticəyə gəldilər ki, onların hərəsi bir tərəfdən erməni kəndlərinin üzərinə hücuma keçsinlər. Kürdlərin sərkərdəsi İbrahim bəy idi. Onlar, yəni İbrahim bəyin dəstəsi əvvəlcə Kiki Kələntərovun yaşadığı Cəmilli kəndinin üstünə yeridilər. Bu kənddə Kiki Kələntərovun yaxşı imarətləri var idi. Onun evində olən bəzi şeyləri qarət etdikdən sonra qalanını od vurub yandırdılar. Cəmilli kəndindən bu hücum nəticəsində qaçanlar qaçmışdı. Qalanları isə qayaların arxasından, evlərin pəncərələrindən İbrahim bəyin dəstəsinə atəş açırdılar, Müsəlmanlar isə çöldən onları gülləbaran edirdilər. Bu hücum nəticəsində bütün kənd yandırıldı və 11 nəfər erməni öldürüldü.

Həmin vaxt xəlifəlilər Xənəzək kəndinin üzərinə hücum çəkərək kəndin yarıdan çoxunu yandırdılar və əllərinə keçən erməniləri qətlə yetirdilər.

Xəlfəlilərin arasında Qasım adlı çox qeyrətli və işgüzar bir cavan vardı. O, bu hücumda ermənilərlə çox böyük cəsarət və qəhrəmanlıqla vuruşurdu. Qasım dörd erməni öldürmüşdü. Birdən ona bir güllə dəyib onu yerə sərdi. Kosalar kəndindən olan bu cavan döyüş meydanında qəhrəmancasına həlak oldu. Onun cənazəsini Kosalar kəndinə gətirdilər. Molla Qalada olduğundan bir neçə nəfəri at və qatırla mollanı gətirmək üçün oraya göndərdilər. Yolda onları ermənilər Yel

dəyirmanı qayasından və Qaybalı kəndindən atəşə tutdular. Onlar at və qatırlarını buraxıb böyük çətinliklərlə daşların arxasıyla gəlib Qalaya çatdılar. Gələn kişilərdən birisi Qalaya çatan kimi çığıra-çığıra camaata xəbər verdi ki, ermənilər davaya gəlirlər. Camaat dükan-bazarı bağlayıb, cavanlar silahlanıb səngərlərə doluşurlar. Əhvalatı belə görən vilayət hakimi müsəlmanları sakitləşdirərək deyilənlərin hamısının yalan olduğunu söyləyir.

Bağlardan olan atlılar və piyadalar isə dalbadal erməni kəndlərini yandıra-yandıra gəlib Xoramord kəndinə çatdılar. O kənddə də xeyli erməni öldürüb evlərini yandırdılar, mallarını isə qənimət kimi ələ keçirdilər.

**Ə L A V Ə:** Bir neçə gün bu əhvalatdan qabaq dörd nəfər müsəlman Süleymanlı kəndi yaxınlığında yerləşən müşahidə məntəqəsinə yaxınlaşırlar. Həmin müşahidə məntəqəsində ermənilərin səngərləri var imiş. Hər gecə həmin səngərlərdə neçə nəfər erməni keşik çəkərmiş. Dörd nəfər müsəlman yavaş-yavaş həmin səngərlərə yaxınlaşaraq gördülər ki, dörd nəfər erməni yemək süfrəsi açıblar. Biri ağacda kabab bişirir, o biriləri isə süfrəni düzəldir və şərab şüşələrinin ağzını açırlar. Dörd ədəd tüfəngi isə kənarda baş-başa çatmışdılar. Müsəlman cavanları qəflətən sıçrayıb ermənilərin tüfənglərini ələ keçirdilər və yenə də cəld səngərlərə girib tüfəngləri ermənilərə tərəf tuşladılar. Ermənilər baş verən hadisədən dəhşətə gələrək, müsəlmanlara yalvarmağa başladılar ki, bizi öldürməyin, patrondaşları da sizə verəcəyik. Ermənilər patrondaşları çıxarıb atdılar. Müsəlmanlar patrondaşları götürdükdən sonra ermənilərin dördünü də güllələyib kəndlərinə qayıtdılar.

## MALIBƏYLİ ƏHVALATI

Şəvval ayının 17-si, cümə axşamı Şuşakənddən, Daşkənddən, Muxətərdən, Keşişkənddən və Daşaltıdan neçə yüz erməni yığılaraq qımdatlarla məsləhətləşib belə qərara gəldilər ki, müsəlmanların qüvvələrini zəiflətmək məqsədilə kəndlərdən onları qovub təmizləsinlər. Bundan sonra Qalaya hücum çəkib müsəlmanların müqavimətini sındırmaq asan olacağını söylədilər. Ermənilər tökdükləri tədbirlərə əsasən birinci Malıbəylinin üstünə hücum çəkib oranı tar-mar etmək, ev-eşiklərini yandırıb mallarını qarət etmək fikrində idilər.

Ermənilər bu məqsədlərini həyata keçirmək üçün səhər tezdən Malıbəylinin üzərinə hərəkət etdilər. Bu hücumda neçə yüz adam və kəl arabaları iştirak edirdi. Onlar kəl arabalarını müsəlmanların mallarını qarət edib aparmaq üçün gətirirdilər. Ermənilər Malıbəylini qiblə və qərb tərəfdən mühasirəyə aldılar. Hücum səhər tezdən olduğuna görə səngərdə olanlar yatmışdılar. Kəndin səhər tezdən oyananları hücumdən xəbərdar olub başqalarına da məlumat verdilər. Səngərdə dayanmış müsəlmanlar bu qədər ermənini görən kimi bir-iki güllə atdılar. Ermənilər isə hər səngərə yüzə qədər tüfəngdən atəş açdılar. Odur ki, səngərdəkilər atəşin belə çoxluğundan vəhşətə gəlib səngərlərdən kəndin içərisinə qaçırdılar. Ermənilər isə

səngərləri tutaraq kəndə daxil oldular. Onlar Hacı Təhmirəzin evini ələ keçirərək hər tərəfdən ona od vurdular. Qımdatlardan ikisi sevincindən evin balkonunda şadlıq edirdilər. Belə ki, biri əl çalıb, o birisi oynayırdı. Bu zaman Malıbəylinin igidləri və tüfəngdarları əhvalatı belə görən kimi nərə çəkib hər tərəfdən ermənilərin üzərinə hücum çəkdilər. Bir cavan müsəlman Hacı Təhmirəzin evinin balkonunda oynayan ermənini sinəsindən nişan alaraq elə vurdu ki, erməni bircə dəfə çığırıb yerə yıxıldı. Həmin cavan bir güllə də çəpik çalan qımdata vurdu. O da bərk qışqırıb o biri ermənin yanına yıxıldı.

Müsəlmanlardan bir atlı Xankəndinə, o birisi isə Qalaya xəbər gətirib onlardan kömək tələb etdilər. Dərhal Qalada cavan müsəlman döyüşçüləri toplaşaraq Ağa Şamil və Bəşir bəyin rəhbərliyi altında Malıbəyliyə tərəf yollandılar. Xankəndindən isə bir dəstə müsəlmanlar kazaklarla birlikdə Malıbəyliyə gəldilər. Qaladan və Xankəndindən kömək gələnə kimi Malıbəyli cavanları hər tərəfdən ermənilərin üzərinə hücuma keçmişdilər. Hər iki tərəfdən güllə yağış kimi yağırdı. Hacı Təhmirəzin evinin balkonunda iki qımdat öldürüldükdən sonra ermənilər qaçmağa başladılar. Müsəlmanlar onları təqib edərək gülləyə tuturdular. Bu təqib zamanı daha doqquz erməni öldürüldü, neçəsi isə yaralandı.

Ermənilərin Malıbəyliyə hücumunun başlanğıcında Hacı Təhmirəzin evinin yanında vuruşma gedərkən müsəlmanlar evi hər tərəfdən gülləyə tuturdular ki, ermənilər oraya daxil olmasın. Bu zaman ermənilərin əlinə düşməsin deyə evin bəzi qiymətli əşyalarını yığıb özləri ilə aparmaq istəyən iki övrətin erməni olduğunu güman edən müsəlman cavanları səhvən onları da vurub öldürmüşdülər.

Ermənilər Malıbəylidən çıxarıldıqdan sonra Xankəndindən və Qaladan gələn dəstələr gurultu ilə Malıbəyliyə daxil oldular və onlar Malıbəyli müdafiəçilərinə qoşularaq salavat və «Ya Əli!» nərələri çəkib cəsarətlə ermənilərin üzərinə hücum çəkdilər. Ermənilərin güllələbaran edilməsi nəticəsində daha on beş erməni öldürüldü. Ermənilər vəziyyəti belə görən kimi pərən-pərən olub qaçmağa başladılar. Həmin həlak olan 15 nəfərin meyidini də götürüb kənarda saxladılmış və qənimət üçün gətirilmiş arabalara qoyub apardılar. Hacı Təhmirəzin evində öldürülmüş 9 erməni meyidi isə oradaca evlə birlikdə yanmışdı. Qaçan erməniləri müsəlman döyüşçüləri güllələbaran edə-edə təqib edirdilər. Sonra daşların dibində, çökək və çuxur yerlərdə ölən ermənilərin meyidlərini saydılar. Onların miqdarı 80 nəfərə çatmışdı. Müsəlmanlar tərəfdən isə bu davada ölənlər Hacı Məhəmmədin bir cavan oğlu və Hacı Təlmirəzin evindəki iki övrət olmuşdur.

Hacı Təhmirəzin evində öldürülmüş 9 nəfər ermənidən beşi kazak çinovniki paltarları geyiniblərmiş ki, müsəlmanlar onları kazak bilib atəş açmasınlar.

## QAYBALI KƏNDİNİN ƏHVALATI

Xəlfəlilər belə bir tədbir görmüşdülər ki, şəvval ayının 18-də gecə qəflətən Qaybalı kəndinin üzərinə hücum edərək oranı darmadağın etsinlər. Bir naxələf, zatı qəliz müsəlman gedib Qaybalı ermənilərini xəlfəlilərin tədbirindən xəbərdar edir. Ermənilər tədbirdən xəbərdar olan kimi Qalaya və kəndlərə adamlar göndərib tezliklə kömək göndərmələrini tələb edirlər. Hər yerdən ermənilər cəm olub Qaybalıya gəlirlər. Köməyə gələn ermənilər iki yerə bölünərək bir qismi kəndi mühafizə etmək üçün orada qalır, digər qismi isə silahlarını götürüb başqa bir yerdə gizlənirlər. Gecədən 4 saat keçdikdən sonra 30-40 nəfər xəlfəli və neçə nəfər kürd tayfasından hamısı silahlı Qaybalının üzərinə hücuma keçdilər. Onlar əvvəlcə iki dənə mərəyə od vurdular. Ondan sonra kəndi gülləyə tutdular. Kənd əhli hücumdan qabaqcadan xəbərdar olmasına baxmayaraq, nalə və fəryadları göyə ucaldı. Onların bir parası tüfəng atmağa, qışqırıq salmağa və bir parası isə yalvarıb Həzrəti-Abbası köməyə çağırmağa başladılar. Xülasə, bunları gülləbaran edib atışırdılar. Ermənilərdən 11 nəfər qətlə yetirilmişdi ki, bu vaxt pusquda durmuş ermənilər Qaybalı yaxınlığında yerləşən bir neçə müsəlman evlərinin üzərinə hücum çəkdilər. Bu evlərdə yaşayan müsəlmanların babası laçınlı Məhəmməd ləqəbi daşımış məşhur aşpaz olmuşdu. Ermənilər həmin laçınlıların evlərini gülləbaran etməyə başladılar. Onların aş qazanlarına da od vurub yandırdılar. Əhvalatdan xəbərdar olan kimi müsəlmanlar Qaybalıdan qayıdıb laçınlılara köməyə gəldilər. Onlar erməniləri güllәbaran edərək oradan qovdular. Nəhayət, atışma dayandı və sakitlik yarandı.

## 20 ŞƏVVAL 1323 (1905)-ci İLDƏ PİRƏMƏKİDƏ BAŞ VERƏN ƏHVALAT

Bu günlərdə Qala igidlərindən və gözətçilərindən ibarət müsəlmanlar atlanıb Malıbəyliyə gəldilər. Oradan da bir neçə gənc bələdçilər bunlara qoşulub atlarını birbaşa Pirəməki deyilən yerə sürdülər. Pirəməki Şuşakənd ermənilərinin ot-ələf və əkinçilik yerləri idi. Həmin yerdə böyük-böyük ot tayaları var idi. Ermənilərin biçib yığdıqları 150 tayaya və neçə mərəklərə, talvarlara od vurub yandırdılar. Ot tayalarının alovları Qaladan görünürdü. Tayalar yandırıldıqdan sonra müsəlmanlar rus kazakları ilə sözü bir yerə qoyub Pirəməkidəki bütün məxzənlərdə və quyularda olan arpa və buğdanı çıxarıb arabalara yükləyib özlərinə mal etdilər.

Həmin günün sabahı divan əhli Pirəməkiyə gəldi. Ətrafı, dağları və meşələri təftiş etməyə başladılar. Təftiş zamanı Malıbəylidə baş vermiş erməni-müsəlman davası nəticəsində həlak olmuş iyirmi nəfər erməninin meyidini tapdılar. Onların hamısının patrondaşları əyinlərində, tüfəngləri isə yanında düşüb qalmışdı. Bunların əksəriyyəti yaralı olduğundan qaçıb özlərini xilas etmək istəyiblərsə də,

mümkün olmayıb. Hərəsi bir yanda yıxılıb ölüblər. Ermənilərin divana verdiyi məlumata görə, 107 nəfər erməni ölmüşdü.

Təəccüb və təəssüf doğuran budur ki, erməni milləti bu qədər can və mal xəsarətinə düçar olsalar da, tutduqları əməldən bir nəticə çıxarmayıb nə peşiman olurlar, nə də qəflət yuxusundan ayılırlar. Hər şəhərin və hər kəndin içində, ömrü boyu öz əməyi ilə iki qara pul qazanmayan və həmişə fitnə-fəsadlar törədərək milləti min cür bəlalara düçar edən qımdatlar yazıq sadə erməniləri hədələyərək onların zəhmətlə qazandıqları pullarını min bəhanə ilə əllərindən alıb ciblərini doldurur və kefləri də istəyəndə min cür hiylələr işlədib həm onları, həm də başqalarını öldürürdülər. Övrət və uşaqlarını isə ac və yalavac, gözləri yaşlı qoyurlar.

## İRƏVANLI ERMƏNİ HƏMZATIN ƏHVALATI
## (24 şəvval 1323-cü il)

Cavanşir eli tərəfdən dalbadal kağızlar gəldi ki, neçə yüz müsəlman atlısı yekdil olub erməni kəndlərinə basqınlar edirlər. Onlar hansı kəndə girirlərsə, ermənilərə səngərlərə girməyə fürsət vermirdilər. Onlar əvvəlcə Sərab adlı kəndə daxil olaraq «Ya Əli» nərəsi çəkə-çəkə ermənilərin üzərinə hücum çəkdilər. Ermənilər bu hücumdan vəhşətə gələrək elə karıxdılar ki, müqavimət göstərməyə qüdrətləri çatmadı. Ermənilər pərən-pərən olaraq əllərinə nə keçdisə götürüb hərə bir tərəfə qaçdı. Bir qismi isə məxfi yerlərdə gizləndilər. Sərab kəndindən sonra müsəlman atlıları Başkəndə, sonra Marağa kəndinə, oradan isə Çaylı kəndinə hücum etdilər və ermənilərə böyük zərbə endirdilər. Müsəlmanlar birdən gördülər ki, onların qarşısına bir-iki erməni qımdatının rəhbərlik etdiyi bir zor dəstə çıxdı. Onlara rəhbərlik edənlərdən biri İrəvan əhlindən olan erməni Həmzat idi. Bu Həmzat neçə-neçə fitnə-fəsadlara və nahaq qanların tökülməsinə bais olmuşdu. Belə ki, İrəvan tərəfdə və Osmanlı dövlətində bir çox iğtişaşların yaradılmasına o rəhbərlik etmişdi. O, Şuşa şəhərinə üç il əvvəl gəlibmiş. Həmzat əvvəlcə özünü qabiliyyətli bir zərgər kimi qələmə verərək müsəlman bazarında zərgərlik dükanı açır. Buna görə də Qarabağın əyanlarının çoxu özləri və qadınları üçün hazırlatmaq istədikləri zinət şeylərini Həmzata sifariş verirdilər. Həmzat isə gizlincə müsəlmanlara qarşı iş aparırdı. O, şəhərdə və kənddə yaşayan ermənilərin birliyinə nail olmaq üçün böyük qımdatların köməyi ilə Osmanlı ermənilərindən gətirdiyi vərəqələr və qəzetlər vasitəsi ilə təbliğat işi apararaq onlarda müsəlmanlara qarşı nifrət yaratmağa çalışırdı. Həmzat müsəlmanların və dövlətin ziddinə iş aparmaqla bərabər, ayrı-ayrı siniflərdən olan qımdat dəstələri yaradırdı. O, qüvvətli qımdat dəstələrinin yaradılmasına nail olduqdan sonra erməni tayfasının dövlətlilərindən böyük miqdarda pullar toplamağa başladı. O, müəyyənləşdirmişdi ki, filan erməni dövlətlisi qımdat divanxanasına bu qədər məbləğdə pul verməlidir. Əgər o şəxs sözsüz-danışıqsız müəyyən edilmiş pulu verirdisə, canını qurtarırdı. Əks halda,

yəni pulu vermədikdə həmin şəxs qımdatlar tərəfindən qətlə yetirilirdi. Beləliklə də, onlar çoxlu miqdarda pul topladılar. Həmzat və onun silahdaşları pul toplamaq məqsədilə oğurluqdan da çəkinmirdilər. Belə ki, bir gün iki-üç nəfər dövlət poçtundan xəzinəyə 43 min manat pul və nə qədər veksel apardıqları zaman qımdatlardan bir neçəsi hücum çəkərək onları öldürmüş və pulları isə aparmışlar. Qımdatlar 43 min pulu apardıqdan sonra daha da tamahlanaraq bir neçə rus böyüklərini öldürdülər. Divan adamları Həmzatın bu əməllərindən və neçə gizli məktublarından xəbərdar olduqdan sonra onu həbs etdilər. O, həbs olunduqdan sonra müsəlman əyanlarından o günədək aldığı qızılların hamısını mənimsəyərək heç kəsə bir qram belə qızıl qaytarmadı. Bir neçə aydan sonra o, həbsxanadan buraxıldı. Həmzat özünə bir at alıb bir neçə qımdatla birlikdə kəndistan yerlərinə gedərək erməni dəstələri yaradıb, əhalini dövlətin ziddinə əməllər törətməyə təhrik edirdi. Bir qədər qüvvətləndikdən sonra isə müsəlmanlarla dava etməyə başladılar. Dövlət onun tutulması üçün neçə dəfə kazaklar göndərsə də, müsəlmanlar ona qarşı mübarizəyə qalxanacan nail olmadı. Müsəlmanlar Həmzatın dəstələri ilə uzun atışmadan və onların sıralarına böyük zərbələr endirdikdən sonra məğlubiyyətə düçar oldular. Bu döyüşdə böyük bir erməni qımdatı da öldürüldü. Ermənilər dərhal həmin qımdatın başını kəsib torbaya qoyaraq onun atı və sursatını özləri ilə birlikdə apardılar. Müsəlmanlar güman etdilər ki, ermənilərin başını apardıqları böyük qımdat Həmzat olmuşdur. Lakin sonra məlum oldu ki, o deyilmiş.

## PAPRAVƏND KƏNDİNİN ƏHVALATI

Müsəlmanların yaşadığı Papravənd kəndi erməni kəndləri ilə əhatə olunmuşdu. Ermənilər burda özlərinin çoxluğuna arxalanaraq ətrafdakı erməni kəndlərindən böyük bir dəstə yaradaraq Mirzə bəy adlı erməni qımdatının rəhbərliyi altında qəflətən hücum edərək Papravənd kəndini mühasirəyə aldılar. Hücum sübh tezdən olduğuna görə kənd əhlinin əksəriyyəti tamam yuxuda, bəziləri isə sübh namazında idilər. Ermənilər kəndi mühasirəyə alarkən bir çoban hündür bir yerdə qoyun otarırdı. Ermənilərin Papravəndə hücumunu görən çoban qoyunları orada buraxıb müsəlman kəndlərinə qaçaraq xəbər verdi ki ermənilər Papravəndə hücum ediblər, onlara kömək etmək lazımdır.. Müsəlmanlar xəbəri eşidən kimi silahlanıb, atlarına minərək Papravəndə tərəf çapdılar. Onlar kəndə çatan kimi salavat nərəsi çəkərək erməniləri arxadan mühasirəyə aldılar. Arxadan və qabaqdan ermənilərə endirilən şiddətli zərbə nəticəsində onların arasında böyük tələfat oldu. Erməni dəstəsinin qarşısında durub atışan və ermənilərə göstəriş verən qımdat Mirzə bəyə birdən dörd güllə vurdular. O, çığırıb yerə səríldi. Onun öldürüldüyünü görən ermənilər qaçmağa başladılar. Müsəlmanlar onları təqib edərək bir qismini öldürdü, bir qismini isə yaraladılar. Ermənilərin sağ qalanları dağlarda və meşələrdə gizləndilər. Müsəlmanlar ermənilərin qarət üçün gətirdikləri kəl arabalarını qənimət kimi ələ keçirdilər.

## ƏSGƏRAN ƏHVALATI

Ermənilər Papravənddə böyük məğlubiyyətə düçar olduqdan sonra qımdatlar belə qərara gəldilər ki, hücum etmək onlar üçün əlverişli deyil. Yaxşısı budur ki, yolları kəsib müsəlmanların gediş-gəlişinə mane olaraq, şəhəri bir növ mühasirədə saxlasınlar. Bu məqsədlə onlar ayrı-ayrı dəstələr düzəldib Əsgəran qalası ətrafında gizli mövqelərdə yerləşdirdilər. Bu dəstələr yol ilə gəlib-gedənlərə güllə atmağa başladılar. Buna görə də yollardan gediş-gəliş kəsildi, kirəkeşlər və arabaçılar üçün hərəkət mümkün olmadı.

Digər tərəfdən isə Rusiya vilayətində və Tiflisdə iğtişaş və tətillərin olması üzündən teleqraf və poçt işləmirdi.

Qalada Yel dəyirmanı deyilən qayaların üstünə çıxaraq yollara nəzarət edən ermənilər gördülər ki, Xəlfəli və Kürdlər yaşayan məntəqələrdən də gəlib-gedən yoxdur. Kirəkeşlər dəyirmanlara un üyütmək üçün taxıl da apara bilmirdilər. Bu səbəbdən də şəhərdə ərzaq get-gedə azalır və bahalıq əmələ gəlirdi. Kasıblar və qəriblər üçün dolanacaq çətinləşirdi. Dəyirmanlar işləmədiyindən və un ehtiyatı azaldığından çörək dükanları bağlanırdı.

**ƏLAVƏ:** Xəbər çıxdı ki, Sisyan tərəfdə ermənilər dəstə bağlayıb müsəlmanların üstünə gəlirlər. Müsəlmanlar da zor bir dəstə yaradıb onların qarşısına çıxaraq atışmağa başladılar. Vuruşma iki gün sərasər davam etdi. Vuruşma zamanı müsəlmanlardan 20 nəfər şəhid oldu, bir neçəsi isə yaralandı. Ermənilər tərəfindən isə yaralananlardan başqa 50 nəfər öldürülmüşdü. Sisyanlılar on nəfər qalaya göndərirlər ki, oradan tüfəng və patron alıb gətirsinlər.

## KAZAKLARLA ERMƏNİLƏRİN ƏLBİR OLMAĞI VƏ MÜSƏLMANLARA XƏYANƏTİ

Yollar bağlı olduğundan altmış ədəd yüklü araba yığışıb Ağdamda qalmışdı. Bu vəziyyətdən təngə gələn kirəkeşlər və əşya sahibləri divana şikayət etdilər. Divan məmurları həmin adamları Şuşaya qədər müşayiət etmək və sağ-salamat oraya çatdırmaq üçün bir dəstə kazak ayırdılar. Camaat pul toplayaraq iki yüz manat kazakların böyüyünə verdilər ki, bunun yüzü sənindir, yüzünü isə kazaklara payla ki, bu arabaları əmin-amanlıqla şəhərə çatdırsınlar. Ağdamın pristavı da bu arabaların və əşyaların sağ-salamat şəhərə çatdırılacağına söz verdi. Xülasə, kazaklar qabaqda, 40-50 araba isə bir-birinin ardınca düzülüb şəhərə yola düşdülər. Hər iki tərəfi hündür olan dərəyə bənzər bir yerə çatarkən gördülər ki, hündür yerdə ermənilər səngər qurub dayanıblar. Kazakların böyüyü kazaklardan birini çağırıb ona nəsə deyib ermənilərin yanına göndərdi. Arabaçılar və əşya sahibləri şübhələnib, hərə bir gümana düşdü. Bir azdan kazak qayıtdı. Ermənilər isə hər tərəfdən qarışqa kimi qaynaşmağa başladılar. Onlar göyə və arabalara güllə ata-ata arabalara yaxınlaşırdılar. Vəziyyəti belə görən Qala əhlindən olan iki nəfər Məşədi

Dadaş və Ağa İsmayıl arabada olan tüfənglərini çıxarıb arabadan düşdülər və bir daşın dalına girərək ermənilərə atəş açmağa başladılar. Bu atəşi görən ermənilər irəli getməyə cürət etmədilər və geri çəkildilər. Arada bir az fürsət yaranan kimi arabaçıların bir parası geri, Ağdama tərəf qaçdılar. Kazakların arasında olan arabaçılar isə qaçmağa fürsət tapa bilmədilər. Amma bir para müsəlmanlar çeviklik edərək arabalara qoşulmuş atları açıb onlara minib qaçdılar. İçi dolu on dörd araba isə kazaklarla ermənilərin arasında qaldı. Ermənilər tökülüb həmin arabalarda olan şeyləri qarət etməyə başladılar. Onlar arabalarda olan qəndi və başqa əşyaları kazaklarla bölüşdürdülər.

Qaçan adamlar araba və əşyalarla gəlib Ağdama çıxdılar. Müsəlmanlar əhvalatdan xəbərdar olan kimi xalq dəstə-dəstə yığışıb danışırdılar ki, oranın pristavı bazara gəldi. Həmin saat ermənilər tərəfindən yolda qarət edilmiş 14 arabanın və əşyaların sahibi qalalı Məşədi Səlim adlı birisi pristavın yaxasından tutub dedi ki, qarət edilmiş 14 arabanın və əşyaların qiyməti qırx min manat eləyir. Mənim pullarımı verməlisən. Pristav gördü ki, ölüm məqamıdır. Dedi məni öldürmə, bir kağız verərəm ki, mən sizə 40 min manat borcluyam. Cənab Cəfər bəy Vəzirzadə qol kağızı almağa razı olmadı. Çünki sonra divana deyər ki, məni öldürürdülər, canımın qorxusundan verdim.

Pristav sözlə birtəhər onların əlindən çıxa bildi. İki gündən sonra orada qalan arabaları geri gətirdilər. O günün sabahısı Xankəndinin yaxınlığında ermənilər tökülüşüb qalalı Məşədi Bəşir adlı bir oğlanın 200 qaramalını apardılar.

Həmin günlərdə Qaladan olan Cəmşid adlı bir nəfər Xocalının ətrafında yol kənarında bir dükan açmışdı. Bağlardan satmaq üçün Qalaya gətirilən bəzi əşyaları o, ucuz qiymətə alaraq burada açdığı dükanda başqa yerlərdən gələn ermənilərə satırdı. Cəmşid kişinin övrət-uşağı da özü ilə birlikdə bu dükanda qalırdı. Müsəlmanlar onu məzəmmət edərək nəsihət verirdilər ki, sən müsəlmansan, tutduğun iş şəriətdən uzaqdır, bu dava vaxtı gördüyün işdən əl çək, əks halda peşman olarsan. Cəmşid kişi heç kəsi eşitmədi və öz nəfsinə qarşı çıxa bilmədi. Çox keçmədi ermənilər bir gün tökülüb Cəmşid kişini və övrət-uşağını öldürdülər, gözəl bir qızını əsir götürdülər, dükanında olan malları isə qarət edərək dağıtdılar.

**Ə L A V Ə:** Yuxarıda göstərilən tarixdə qalalı Məlik Paşayev bir neçə ermənilərlə birlikdə altmış min manatlıq misi apararkən müsəlmanlar tərəfindən tutulub Ağdama aparılmışdır.

## ƏHMƏD BƏYİN QIZI HƏMİDƏ XANIMIN ƏHVALATI

Bu günlərdə Cavanşir Əhməd bəyin qızı Həmidə xanım bir dəstə atlılarla birlikdə böyük təmtəraqla Ağdama gəldi. Ağdamın camaatı onu böyük hörmət və ehtiramla qarşılayaraq bir gözəl mənzildə yerləşdirdilər. Həmidə xanım cənab Cəfər bəyə bildirdi ki, millət xüsusunda camaata bir neçə söz demək istəyir.

Cəfər bəy xeyriyyə məclisinin üzvlərinə buyurdu ki, bazar-dükanlarını bağlanıb camaatın böyük meydana toplaşması haqqında göstəriş versinlər. Camaat və əyanlar yavaş-yavaş böyük meydana toplaşdılar. Həmidə xanım Cəfər bəy ilə birlikdə hündür bir eyvana qalxdılar. Həmidə xanım üzünü Cəfər bəyə tutaraq onun buraya nə məqsədlə gəldiyini camaata çatdırmasını xahiş edir.

Cəfər bəy uca səslə dedi ki, ey əyanlar və müsəlmanlar! Həmidə xanım zəhmət çəkib bu uzaq yolları gəlməkdə məqsədi aşağıdakılardan ibarətdir: Həmidə xanım buyurur ki, mən Qalada bizim qan qardaşlarımızın çox zəhmət və əziyyət çəkdiklərini eşitdim. Mənə məlum oldu ki, kəndlərdə yaşayan ermənilər yolları kəsərək camaatın Qalaya ərzaq və mal gətirməsinə, eləcə də dəyirmana getmələrinə mane olurlar. Buna görə də mən bütün sursatları ilə birlikdə iki yüz atlı toplayaraq onların köməyinə gəlmişəm. Mən bir övrət olsam da, müsəlman qardaşlarımızın belə əziyyət çəkməsi gecə-gündüz mənə əziyyət verərək rahat buraxmırdı. Qardaşlarımız Şuşada belə əziyyətlərə məruz qaldıqları halda biz burada rahat yeyib-içib, yata bilmərik. Mənə yaraşmaz ki, siz olan yerdə mən xalqımızın bu əziyyətdən qurtarılması üçün mübarizə aparam. Ona görə cənablarınızdan xahiş edirəm ki, siz də qüvvələr toplayıb mənim gətirdiyim atlılarla birlikdə zir-zibili müsəlman qardaşlarımızın yolundan təmizləyəsiniz ki, onlar rahat yaşaya bilsinlər.

Meydana yığışan camaat yuxarıda deyilən sözləri eşitcək Həmidə xanımı ürəkdən alqışladılar. Hətta bəzi şəxslər bu sözlərin təsirindən kövrələrək ağladı. Camaat cavab verdi ki, biz yeddi yaşından yetmiş yaşına kimi hamımız malımız və canımızla bu yolda mübarizə aparmağa hazırıq. O yolkəsənlər də öz layiqli cavablarını alacaqlar. Odur ki, siz narahatçılıq keçirmədən öz məqamınıza qayıdın, Allah-təalanın köməyi ilə biz bu işlərin hamısına əncam çəkərik.

Həmidə xanım xeyriyyə məclisinə iki yüz manat nəqd pul və iki yüz pud un və arpa bağışlayıb ehtiramla öz kəndinə təşrif apardı. Allah ondan razı olsun.

## CƏNAB NƏCƏFQULU AĞANIN DƏYİRMANINDA OLMUŞ ƏHVALAT

Qalada get-gedə bahalıq artdığına görə Şuşa cavanları atlanaraq iki araba buğda götürüb Cavanşir Nəcəfqulu ağanın dəyirmanına gəldilər. İki araba buğda dəyirmanda üyüdüldükdən sonra ermənilər dəyirmana hücum çəkərək zorla unu onlardan alıb aparmaq istədilər. Dəyirmanda iki-üç tüfəngli müsəlman var idi. Onlar divarın dalından erməniləri gülləyə tutdular. Bir qədər atışmadan sonra ermənilər heç nə edə bilməyəcəklərinə əmin olub naümid geri qayıtdılar.

Malıbəyli ilə Xankəndi arasında bir erməni qadını ilə uşağın öldürülməsini eşidən ermənilər ştaba üz qoydular. Ştabda bir az rus qoşunu var idi. Eyni zamanda ştabın yerləşdiyi ərazidə bir neçə müsəlman və erməni ailələri yaşayırdı. Vəziyyətin gərginliyini görən müsəlman ailələri tez öz tüfənglərini götürüb müharibəyə hazır vəziyyətdə dayandılar. Onların içərisində çoxlu külfəti olan

Məşədi Zeynal adlı bir nəfər var idi. O, bir erməni ilə qonşuluqda yaşayırdı. Ermənilər tökülüb buraya gələrkən Məşədi Zeynalın erməni qonşusu onun yanına gəlib deyir ki, ermənilər sizi qırmağa gəliblər. Buna görə gəl sən öz övrətin, uşağınla bizim evə daşın, çünki mənim evimdə sizə heç kəs toxunmağa cəsarət etməz. Məşədi erməninin hiyləsinə inanıb bütün külfəti və əşyaları ilə erməninin evinə köçdü. Lakin Məşədinin uşaqları onların erməninin evinə köçməyinə razı deyildilər. Onlar köçdükdən sonra erməni Məşədiyə dedi ki, tüfənglərinizi verin, gizlədim, sonra yenə özünüzə qaytararam. Əks təqdirdə, ermənilər gəlib sizin tüfənglərinizi görsələr, məni də, sizi də öldürərlər. Məşədinin dörd oğlu var idi. Onlar atalarına dedilər ki, bu hiylədir, ermənin sözünə inanma. Tüfənglərimizi versək bizi qıracaqlar.

Məşədi oğlanlarına acıqlanıb tüfənglərin hamısını götürüb erməniyə verdi. Erməni tüfəngləri apardıqdan sonra pusquda duran erməniləri çağırdı. Onlar tökülüb əvvəlcə Məşədinin evini yandırdılar, sonra isə onun özünü, dörd oğlunu, ümumiyyətlə, südəmər uşağına qədər bütün külfətini işgəncə ilə öldürdülər. Ermənilər bu vəhşilikləri törədərkən övrət-uşağın dəhşətli çığırtıları bir-birinə qarışmışdı. Neçə nəfər cavan övrət və gəlinlər var idi. Onlar çığırıb qaçmaq istəyərkən tutub xəncərlə doğrayırdılar. Xülasə, bu yırtıcı heyvanlara bənzəyən ermənilər Məşədinin iyirmiyə qədər külfət üzvlərini doğram-doğram etdilər.

Ey kaş müslimin hamısı baxəbər ola,
Bu zülmdən ki, ermənilər etdi intişar.

Ol tifli-bigünahları kinü zülm ilən
Etdilər parə cismlərin cümlə tarimar.

Qoyun-quzu kimi başını cümlə kəsdilər,
Pamal oldu xakda ol cismi-pürfikar.

Bir zərrə rəhm yoxdu nəsarada et yəqin.
Et bir nəzarə tifillərə eylə aşikar.

Bir toxum əkdilər ki, çıxar rəstaxizədək
Hər şaxü bərgi şüru şərrü nari-pürşərar.

Məşədi Zeynalın ailəsini zülm və işgəncə ilə tamam öldürərək şəhid etdikdən sonra onun mallarını talan etdilər. Bərk atışma nəticəsində on bir nəfər erməni öldürüldü.

Bundan əvvəl isə rus böyükləri ermənilərin Məşədi Zeynalın ailəsinin başına gətirdiyi faciəni eşidib o ərazidə yaşayan müsəlman ailələrini qırğından xilas etmək üçün onların övrət-uşaqlarını toplayıb yaşadıqları kazarmaya apardılar.

Bu zaman ermənilər Sadıq adlı bir müsəlman kişisini də öldürdülər. Ruslar o kişinin qatillərindən iki nəfərini tutdular.

Bu qırğından sonra ermənilər qarət etdikləri malları arabalarla öz evlərinə göndərdilər. Özləri isə atlanıb Nəcəfqulu ağanın dəyirmanına üz qoydular. Müsəlmanlar ermənilərlə ştab ərazisində vuruşarkən fürsət tapıb dəyirmanda olan unun hamısını təcili arabalara doldurub Malıbəyliyə aparmışdılar.

Axşamüstü ermənilər dəyirmana gəlib gördülər ki, müsəlmanlar bütün unları və sair şeyləri tamamən aparıblar. Ermənilər dərhal dəyirmana və Nəcəfqulu ağanın otaqlarına od vurub yandırdılar. Nəcəfqulu ağanın imarətindən, dəyirmanından qalxan tüstü və alov Qaladan görünürdü. Müsəlmanlar bu yanğından çox təəssüfləndilər. Çuxur məhəlləsinin cavanları toplaşaraq qərara gəldilər ki, bu dəyirmanın əvəzini ermənilərdən çıxmaq lazımdır. Təcrübəlilərdən birisi dedi ki, burada, bizim qənşərimizdə Şuşa çayında Xandəmirov Mikitin tikdirdiyi bir maşın dəyirmanı (mexanikləşdirilmiş) var. Əgər Nəcəfqulu ağanın dəyirmanının qiyməti 300 manat olardısa, Mikitin dəyirmanının dəyəri 5000 manat olar. Bir qoçaq igid lazımdır ki, oraya enib həmin dəyirmanı yandırsın. Həmin saat bir neçə gün bundan əvvəl ermənilərin ot tayalarına od vurub yandırmış Daşdəmir adlı bir cavan oğlan irəliyə çıxaraq dedi ki, Allahın köməyi ilə bu saat gedib sizin istəyinizi yerinə yetirərəm.

Daşdəmir beş nəfər cavan oğlanla birlikdə xeyli əski və neft götürüb «bismillah» edərək aşağı dəyirmana tərəf endilər. Dəyirmana çatan kimi onun bir neçə yerindən əski qoyub üzərinə neft tökərək od vurdular. Alov göyə qalxdı. Daşdəmir isə yoldaşları ilə Qalaya qayıtdılar. Çuxur məhəlləsinin cavanları onları alqışladılar.

Ermənilər Şuşakənd tərəfdən böyük bir alov qalxdığını gördülər. Onlar Dəyirmanda müsəlmanların olduğunu zənn edərək oraya çatarkən atəş açmağa başladılar. Sonra ehtiyat edə-edə gəlib oraya çatanda gördülər ki, heç kim yoxdur. Onlar tökülüb dəyirmanı söndürmək istəyəndə gördülər ki, maşınların əsas yerləri yanıb. Onlar dəyirmanı sahibsiz qoyub getdiklərinə çox təəssüfləndilər.

Bir neçə gündən sonra məlum oldu ki, dəyirmanın bir para yerləri yanmayıb. Həmin Daşdəmir altı nəfər cavanla gecə həmin dəyirmana gələrək yanmayan alətlərə və bir neçə otağa od vurub yandırdılar. Bacardıqları qədər də un-buğda götürüb Qalaya gəldilər. Şuşakənddən alovu görənlər dəyirmana tərəf atəş açmağa başladılar. Arada dəyirmandan bir neçə dəfə bərk gurultu səsi gəldi. Dedilər ki, ermənilər aftafalara barıt və yumru dəmirlər dolduraraq lazım gəldikdə onlardan partlayıcı bir maddə kimi istifadə etmişlər. Belə ki, onlar partlatmaq istədikləri yerə həmin aftafadan birini qoyub, piltə ilə lüləyə uzaqdan od vururlar. Bu zaman aftafa gurultu ilə partlayıb, onun parça-parça olmuş gövdəsi və yumru dəmirlər hər tərəfə yayılır. Görünür dəyirmanda partlayan da belə aftafalar olmuşdur.

Ermənilər isə bunun əvəzini çıxmaq üçün Muxətər kəndinə gələrək Hacı Əsgər uşağının burada olan bir bağına və balaca evinə od vurub yandırırlar.

1323-cü il zilqədə ayının 9-da dilənçi Bayramın 12 yaşlı Ağca adlı qızı bir şahı götürüb neft almağa gedir. Yollar bağlı olduğundan bazarda neft olmur. Bir mömin bəndə qızı evinə apararaq şüşəsini neftlə doldurub yola salır. Qız geri qayıdanda yolunu azıb erməni məhəlləsinə çıxır. Ermənilər onu tutub qımdatların yanına aparırlar. Qımdatlar Ağcadan soruşurlar ki, müsəlmanların yeməyi çoxdurmu? Qız cavab verdi ki, hər yerdə çoxdur, amma yalnız bizim evdə yoxdur. Qımdatlar yenə soruşdular ki, müsəlmanların atmağa nəyi var? Qız cavab verdi ki, topları, hamıda və hər evdə tüfəng və tapança çoxdur. Bu sual-cavabdan sonra ermənilər qonşu otağa keçdilər. Bir azdan Ağcanın yanına bir erməni övrəti gələrək qıza dedi ki, bir də ermənilər səndən müsəlmanların əhvalını soruşsa, deginən ki, müsəlmanlar sizi qıracaqlar. Bax, deməsən səni diri-diri öldürəcəklər. Bir də müsəlmanlara deginən ki, dəxi dava bəsdir, evimiz yandı, malımız, dövlətimiz getdi. Allah xatirinə qoysunlar rahat oturaq.

Ermənilər yenə də gəldilər. Onlar qızdan sual etdilər ki, müsəlmanlar nə işdə və nə fikirdədirlər?

Qız cavab verdi ki, sizi qıracaqlar. Erməni onun üzərinə qışqıraraq susmasını əmr etdi. Sonra çay içməyə və horra kimi bir şey yeməyə başladılar. Mənə də təklif etdilər, lakin iyrəndim. Səhərisi gün ermənilər Ağcanı polisə təhvil verdilər və bildirdilər ki, yolunu azıb erməni məhəlləsinə gəlib çıxıbdır. Polis övrəti ilə bərabər, qızı da sankaya mindirib müsəlmanlara təhvil verdilər.

## GÜLABLI ƏHVALATI (1323-cü İL ZİLQƏDƏ AYI)

Bu günlərdə Tağ, Tuğ, Dağdağan, Mirikəndi, Harov və digər ətraf kəndlərdən ermənilər cəm olub qımdatlarla məsləhətləşərək belə qərara gəldilər ki, Qalanı asanlıqla ələ keçirmək üçün əvvəlcə ətraf kəndlərdə yaşayan müsəlmanları erməni hücumları ilə təngə gətirərək bir qismini qırmaq, digər qismini isə qaçırtmaq lazımdır. Kəndlərdən müsəlmanları təmizlədikdən sonra buralar xalis «Hayastan torpağına» (Ermənistan) çevriləcək. Bu məqsədlərini həyata keçirmək üçün əvvəlcə Gülablı üzərinə hücuma keçdilər. Onlar Gülablıya çatarkən əvvəlcə bir adam göndərdilər ki, kəndin özündən bir xəbər gətirsin. Həmin adam gəlib gördü ki, kəndin kişilərinin çoxu Qalada, kənd-bazarlarda, toylardadırlar. Kənddə isə övrət-uşaq və qocalardan və bir neçə tüfəngdardan başqa heç kəs yoxdur. Odur ki, ermənilər cəsarətlə kəndin üzərinə yeridilər. Əvvəlcə istədilər ki, məscidi dağıtsınlar. Kənddə olan tüfəngdarlar səngərlərə girərək erməniləri gülləyə tutdular. Beləliklə, atışma başladı və dörd saat davam etdi. Ermənilərin çoxusu açıqda, müsəlmanlar isə səngərlərdə olduğundan ermənilərdən 61 nəfər qətlə yetirildi. Az qalmışdı ki, ermənilər geri qayıtsınlar. Bu zaman müsəlmanların gülləsi qurtardı. Onlar qaçıb bir yerdə gizləndilər. Ermənilər əhvalatı başa düşüb

kəndə daxil oldular. Onlar evləri gəzə-gəzə qarət edirdilər. Ermənilər 20 nəfər uşaq, bir neçə qoca və bir kor kişinin qapıları bağlayaraq gizləndikləri bir evə çatdılar. Ermənilər evin bir tərəfini deşib ot-saman qoyaraq od vurdular. Evdəkilər tüstüyə tab gətirə bilməyib qapını açaraq bayıra çıxdılar. Ermənilər tökülüb bu günahsız uşaqların və qocaların hamısını gülləyə tutub qətlə yetirdilər. Əllərinə düşən malları isə qarət edib apardılar. Sonra isə məscidə dolaraq orada olan xalı, gəbə və sairə əşyaları qarət etdikdən sonra minbərinə od vurdular.

Ermənilər Gülablıdan sonra Abdal kəndinə hücum edərək onu mühasirəyə aldılar. Bir gecə-gündüz atışma davam etdi. Bu davada müsəlmanlardan 40 nəfər kişi, övrət-uşaq qətlə yetirildi. Ermənilər burada da məscidi qarət etdilər.

**Ə L A V Ə:** Bu günlərdə Malıbəylidə olan kazaklardan biri və bir nəfər də qoca müsəlman hər ikisi bir araba ot aparmaq üçün ştaba gəldilər. Bu zaman ermənilər onları gülləyə tutdular. Bu qəfil atəşdən kazak ağır yaralandı, müsəlman isə həlak oldu. Kazaklar istədilər ki, orada olan ermənilərin hamısını qırsınlar, lakin onların böyüyü buna mane oldu. Kazakların rəisinin göstərişi ilə erməni evlərinin hamısı mühasirəyə alınaraq axtarış aparıldı. Tapılan tüfəng və patronların hamısı müsadirə olundu. Bir ermənінin dükanından iki bomba, xeyli barıt və bir neçə ədəd beşaçılan tüfəng tapıldı. Təftiş nəticəsində ermənilərdən yetmiş ədəd tüfəng müsadirə olundu.

**Ə L A V Ə:** Şuşanın yolu bağlı olduğundan ərzaq qıtlığı yaranmışdı. Bir daha müsəlmanların izzətli əyanları və camaatı Qalaya göndərmək üçün neçə min pud un, düyü, buğda, qənd, neft və başqa şeylər tədarük etdilər. Dövlət Qala yolunu ermənilərdən azad etmək üçün top və beşaçılan tüfənglərlə silahlanmış bir neçə dəstə əsgər və onlara rüşvət almayan, xoş xasiyyət bir komandir göndərmişdi. Həmin komandir öz dəstəsi ilə Ağdama gələrək gördü ki, Qala yolunu erməni quldurlarından azad etmək üçün beş minə qədər silahlı müsəlman igidləri atlanaraq onu gözləyirlər. Dövlət dəstələrinin komandiri onlara müraciət edərək bildirdi ki, sizin bu işdən ötrü oraya getməyiniz lazım deyil. Mən öz qoşunumla bu yolların açılmasına, şəhərə sursat və ərzaq çatdırılmasına müvəkkiləm. Ayrı işlərə mən qarışmıram. Odur ki, yolları açıb ərzağı Qalaya çatdırdıqdan sonra siz mənsiz nə istəsəniz edə bilərsiniz. Bu sizin öz işinizdir.

Bundan sonra camaat tədarük etdikləri ərzaq və başqa şeyləri yetmiş arabaya yükləyərək dövlət qoşunu ilə birlikdə Şuşaya yola düşdülər. Əsgərana çatan kimi komandirin əmri ilə yolun hər iki tərəfində hündürlüklərdə düzəldilmiş erməni səngərlərinə toplardan atəş açdılar. Ermənilər pərən-pərən olub hərəsi bir tərəfə qaçdı. Səngərlərdə bir erməni belə qalmadı. Xan bağından keçənədək yol boyu qurulmuş erməni səngərlərinin hamısı toplardan açılan atəşlərlə darmadağın edildi. Bu atəşlərin qarşısına bir erməni belə cürət edib çıxa bilmədi.

Beləliklə, ərzaq dolu arabalar və qoşun gəlib Şuşaya daxil oldu. Arabalarda gətirilmiş ərzağın bir qismi sahiblərinə çatdırıldı, bir qismi isə ucuz qiymətə kasıblara və qəriblərə satıldı. Gətirilmiş un isə çörəkçilərə verildi ki, bişirib ucuz

qiymətə xalqa satsınlar. Dövlət qoşununun əsgərləri evlərdə, komandir isə deputat Balaca Hacı Sadığın evində tam ehtiramla yerləşdirildi. Şəhərin əyanları və ziyalıları gəlib komandirə öz razılıqlarını bildirdilər.

Bir həftədən sonra şəhərdə əhalinin güzəranı yenə də çətinləşdi. Nəcib və qeyrətli müsəlmanlar 130 araba ərzaq hazırlayıb qoşunla birlikdə Şuşaya gətirdilər. Yolda ermənilər arabaların hərəkətinə mane olmaq istəsələr də buna nail ola bilmədilər. Atılan topların səslərini eşitcək hərəsi bir tərəfə dağılırdı.

Ərzaq gəlib Şuşaya çatdıqdan sonra qoşunu müşayiət edən və 12 at qoşulmuş divardağıdan topu gətirib divanxananın qabağına qoydular. Bu vaxt erməni Kiki Kələntərov da generala yaxınlaşaraq xahiş etdi ki, onun şərəfinə erməni məhəlləsində hazırlanmış gözəl mənzilə buyursun. General acıqla ona cavab verdi ki, siz erməni tayfasına inanmaq olmaz. Gürcü, müsəlman və rus qardaşdırlar. Onların sözləri də, özləri də düzdür. Ancaq sizin tayfaya etibar etmək olmaz. Buna görə də mən müsəlman məhəlləsində qalacağam.

## AYRI-AYRI KƏNDLƏRDƏ BAŞ VERMİŞ MÜNAQİŞƏLƏR (1323-cü İLİN ZİLQƏDƏ AYI)

Bu tarixdə müsəlmanların Sərv kəndində ermənilərlə bərk toqquşması oldu. Müsəlmanların bir parası bu toqquşmaya hazır olmadığından əvvəlcə müsəlmanlardan iyirmi nəfər şəhid oldu. Bundan qeyzlənən müsəlman silahlıları «Ya Allah» deyərək erməniləri mühasirəyə alıb güllələbaran etdilər. Ermənilərdən 50 nəfərdən çox adam öldürüldü, o qədər də yaralandı. Bundan sonra ermənilər qayıdıb səngərlərə girdilər. Müsəlmanlar da öz yerlərinə qayıtdılar.

Həmin tarixdə Cavanşir müsəlmanları dəstə bağlayıb Çaylı kəndinə hücum etdilər. Bu hücumda on iki nəfər erməni öldürüldükdən və iyirmiyyə qədər yaralandıqdan sonra qalanları qaçmağa başladılar. Kənd tamamilə boşaldı və müsəlmanların əlinə keçdi. Qaçan ermənilər bütün kəndlərə səpələnərək baş vermiş hadisə haqqında onları xəbərdar etdilər. Bir neçə kənddən ermənilər toplaşaraq Dəmirli adlı müsəlman kəndinə hücum etdilər. Kəndin əhalisi uzaqgörənlik edib qabaqcadan əşya və azuqələrini başqa yerə aparmışdılar. Odur ki, bu balaca kəndə hücum nəticəsində o qədər də zərər dəyməmişdi. Kəndin əhalisi isə qonşu kəndlərə qaçmışdılar.

Əhvalatdan xəbərdar olan Cavanşir igidləri bir neçə dəstə döyüşçü ilə Canyataq və Gülyataq kəndlərinin üzərinə yerimişlər. Onlar kəndləri hər tərəfdən mühasirə etsələr də iki yerdən qaçmağa fürsət var idi.

Atı və ulağı olanlar öz övrət-uşaqlarını və azuqələrini götürüb həmin yerlərdən çıxıb qaçdılar. Kəndlərdə qalanlardan yüz nəfərə qədəri öldürüldü, yüzdən artığı da yaralandı. Kəndlərdə qalan ermənilərin yaxşı sursat ehtiyatı olduğundan səngərlərə girib atışırdılar.

## HUMAY BƏY GƏRAY BƏY OĞLUNUN QƏTLİ

Şuşa qalasının sakini Gəray bəyin oğlu Humay bəy ermənilərlə vuruşan dəstənin başçısı idi. Humay bəy mahir döyüşçü olduğundan camaata müharibə aparmağın üsullarını təlim edirdi. Bir gün beləcə təlim keçərkən oraya bir kazak gəlib çıxdı. O, əlini yuxarı qaldıraraq Humay bəyə təzim edib irəli gəldi. Kazak Humay bəylə əl tutduqdan sonra rusca ona dedi ki, bu tayfa (erməni) nə üçün bu nahaq davanı salıb xalqın rahatlığını kəsir. Humay bəy ona dedi ki, ermənilər özləri bu davanı başlayıblar, özləri də cəzasını çəkəcəklər. Bu vaxt Humay bəy geri döndü ki, təlim keçdiyi müsəlmanlara nə isə desin, bu zaman həmin namərd, məlun kazak Humay bəyi arxadan güllə ilə vurub şəhid etdi. Kazak Humay bəyi vuran kimi qaçıb ermənilərin içinə girdi. Sonradan məlum oldu ki, həmin kazak erməni imiş.

## QACAR KƏNDİNİN ƏHVALATI
## (1323-cü il zilhiccə ayı)

Erməni tayfası kəndlərdən bir neçə dəstələr yaradaraq Qacar kəndinin üstünə hərəkət etdilər. Qacar kəndinin bir tərəfdən yerləşdiyi ərazi təhlükəli idi. Çünki Qacar kəndi erməni kəndləri ilə əhatə olunmuşdur. Bu rayonda müsəlmanlar az idi. Ermənilər əvvəlcə kəndin kənarında yerləşən üç evə hücum edərək həmin evlərdən birinə və həyətlərdə yığılmış ot tayalarına od vurub yandırdılar. İki nəfər müsəlmanı şəhid etdilər, birini isə yaraladılar. Əhvalatdan xəbərdar olan kimi Qacar kəndinin əhalisi yaxşı tədarük etdikləri silahlarla silahlanaraq ermənilərin qarşısına çıxdılar və onları hər tərəfdən gülləyə tutdular. Atışma bir neçə saat davam etdi.

Ermənilərin Qacar kəndinə hücum etmələri haqqında xəbər tutan kimi ətraf müsəlman kəndlərindən çoxlu atlılar və piyadalar Qacar əhalisinin köməyinə gəldi. Köməyə gələn qüvvələrlə Qacar kəndinin döyüşən igidləri erməniləri mühasirəyə alaraq nərələr çəkib «A gədə, dur gəldim» deyir və onları gülləyə tuturdular. Qacar əhalisi kəndin içindən, köməyə gələn qüvvələr isə arxadan erməniləri qırmağa başladılar. Müsəlmanlar «Ya Əli!» nərəsi çəkə-çəkə onları təqib edib qırırdılar. Beləliklə, onları Tağ və Tuğ kəndinə kimi qovdular. Hər tərəf erməni meyidləri ilə dolu idi. Çoxunun tüfəngi, tapançası, patron və patrondaşları yanlarında düşüb qalmışdı. Qacar kəndinin ətrafında 135 nəfər yollarda və 265 nəfər isə çöllərdə erməni öldürülmüşdü. Beləliklə də, ermənilərin Qacar kəndinə hücumu onlardan 400 nəfərin ölümü ilə nəticələndi.

Müsəlman dəstələri Qacar kəndinə hücum etmiş erməniləri məğlub etdikdən sonra sərsər küləyi kimi Dirəxtin kəndinin üstünə gəldilər. Burada olan ermənilərin bir qismi qaçıb canını qurtardı, ələ düşənlər isə qətlə yetirildi. Dirəxtin kəndindən sonra müsəlman dəstələri Əfşar kəndinə hücum etdilər. Burada olan ermənilərə

lazımı zərbələr endirdikdən sonra Təcavirt binalarını və üç erməni dəyirmanını da dağıtdılar.

Bu əhvalatdan bir neçə gün keçdikdən sonra bir erməni gizlincə gəlib, Qacar müsəlmanlarına xəbər verdi ki, bizim ermənilərdən bir neçəsi geyimini dəyişərək kazak çinovniki paltarında gəlib sizin silahlarınızı yığmağa cəhd edəcəkdir. Onların məqsədləri budur ki, silahları yığdıqdan sonra tökülüb sizi qırsınlar. Amma Allah xatirinə, mənim adımı çəkməyin, çünki mənim buraya gəldiyimi qımdatlar bilsələr, nəslimi yer üzündən silərlər.

Müsəlmanlar onu arxayın etdilər. Bir neçə gündən sonra Qacar kəndinə bir general və yanında da neçə atlı kazak gəldi. General kəndin böyüklərini çağırıb əmr etdi ki, kənddə nə qədər tüfənginiz var, hamısını gətirib təhvil verin, əks təqdirdə kəndiniz top atəşilə viran ediləcək. Müsəlmanlar dörd tüfəng gətirib verdikdən sonra generala dedilər ki, bütün silahları toplayanadək buyurun içəridə əyləşin. General çinində olan və kazaklar atdan düşüb içəri girdilər. General təşəxxüslə bir hündür yerdə əyləşdi, kazaklar isə onun yanında ayaq üstə dayandılar. Müsəlmanlar isə bərkdən bir-birini səsləyərək deyirdilər:

— Ey kənd əhli, tüfənglərinizi yığın tez gətirin ki, general məəttəl olmasın.

Bir az keçdikdən sonra bir neçə nəfər əllərində tüfəng içəriyə girərək generalı və kazakları güllələyib öldürdülər. Onların silah və atlarına da sahib oldular.

## İRAN VƏ QARABAĞ ATLILARININ HÜCUMU
## (1323-cü il zilhiccə ayı)

İran təbəələrindən ibarət top və tüfənglə silahlanmış dəstə Ağdama gəldi. Ağdamda olan qalalılardan 100 nəfəri Şuşaya gələrək xəbər verdilər ki, iranlı qardaşları onlara sursat gətirmiş və qış günündə müsəlmanlara kömək etmək üçün zəhmət çəkib Ağdama gəlmişlər.

Ağdamda iranlı qardaşları əyanlar və camaat böyük ehtiramla rahat mənzillərdə yerləşdirdilər. Bir neçə gün yaxşı istirahətdən sonra iranlı qardaşlar bildirdilər ki, biz buraya aş-plov yeməyə gəlməmişik. Bizim məqsədimiz müsəlman qardaşlarımızı erməni quldurlarından müdafiə etməkdir. Bu minvalla 15 gün keçdikdən sonra İrandan gələn atlılarla birlikdə Qarabağ igidləri Aranzəmin və Pircamal kəndlərinin üzərinə hücum etdilər. Onlar gülləleri qənaətlə işlədərək çox erməniləri xəncər və qılıncla öldürürdülər. Bu minval ilə hər iki kənddən 213 nəfər erməni öldürdülər. Ermənilərin çoxu meşələrə və dağlara qaçaraq ağacların arasında, qayalıqlarda gizləndilər. Hücum başa çatdıqdan sonra iranlılar öz ölkələrinə qayıtdılar.

## HACI ABBASIN ƏHVALATI

Hacı Abbas belə deyir ki, dava sakitləşdikdən sonra ermənilərin əksəriyyəti ayrı-ayrı vilayətlərə getməyə başladılar. Bir gün mən yolla gedərkən Muğdusi oğlu Minas adlı bir sövdəgər qarşıma çıxdı. O, külfəti ilə birlikdə arabada Tiflisə gedirdi. Məni görcək dedi ki, Hacı, Allah sizi saxlasın, görürsən sizin müsəlmanlar məni nə günə saldılar? Din haqqı, mənim o qədər dövlətimdən çiynimə saldığım bircə bu şal qalıb. Bu mənim həm paltarım, həm də yorğan-döşəyimdir.

Minasın oğlu atasına dedi ki, zərər yoxdur, bu günün sabahı var. Əlbəttə, biz də əvəzini çıxarıq. Sonra mən Minasın oğluna dedim: —Ey oğlan, yadında varmı ki, davadan irəli mən sizin evin qabağından gedirdim. Gördüm ki, sən evin balkonunda durubsan. Bu zaman sizin balkonun altından bir qoca müsəlman keçirdi. Sən onu görən kimi daş ilə vurdun. Kişi səbəbini soruşanda sən o kişiyə acıqlanıb dedin ki, mən qəsdən səni vurdum. O kişi də sənə dedi ki, mənə etdiyin bu zülmə görə Allah-təala sizin evinizi xarabaya döndərib, sizi də zəlil etsin. İndi həmin kişinin bəd duasıdır ki, sizi tutdu. Eviniz-malınız tamam yanıb, özünüz də belə zəlil günə qalmısınız. Allah-təala adildir, haqqı nahaqqa verməz. Bir də ki, davanı və mərdümazarlığı ermənilər saldı, müsəlmanların sizə heç bir iddiası yoxdur.

## SİSYAN KƏNDİNİN ƏHVALATI

Ermənilər böyük və qüvvətli dəstə yaradaraq müsəlmanların yaşadıqları Sisyan kəndinə hücum etdilər. Kənd sakinlərinin silahları və patronları az olduğuna görə döyüş onlar üçün ağır keçdi. Erməni quldurları kənd əhalisindən 20 nəfərini öldürdü, xeyli insan isə yaralandı. Müsəlmanlar az olsa da, bu şəhidlərin əvəzini çıxdılar. Bir neçə saat atışmadan sonra ermənilər geri qayıtdılar. Həmin günün səhərisi Sisyan kəndinin əhalisindən bir neçə nəfər Qalaya gələrək imkanları daxilində tüfəng və patronlar alıb kəndə gətirdilər. Bununla yanaşı, onlar Sisyan kəndinin ətrafında yerləşən müsəlman kəndlərinə, o cümlədən kürd tayfasına müraciət edib kömək istədilər. Sisyana ətraf kəndlərdən kömək gəldikdən sonra ermənilər yaşayan Darabas kəndinə hücum etdilər. Onlar kəndi hər tərəfdən mühasirəyə alaraq kəndin içinə doldular. Kənd əhalisindən olan kişiləri qətlə yetirdilər. Müsəlmanlar kənddə olan övrət-uşaqlarla işləri olmayıb onları döyüş meydanından kənara çıxarırdılar. Müsəlman igidləri Darabas kəndində öz əməliyyatlarını başa çatdırdıqdan sonra geri qayıtdılar. Səhərisi gün isə Lori kəndinin üstünə yeridilər. Bu kənddə də ermənilərə qüvvətli zərbələr endirərək böyük qənimətlə Sisyana qayıtdılar.

## VAĞADÜ DAVASI (1323-cü il zilhiccə ayı)

Yuxarıda zikr olunan əhvalatdan bir neçə gün sonra erməni tayfası yenə də toplaşaraq müsəlman kəndlərinə hücum etmək üçün bir dəstə yaradır. Yaxşı silahlanmış bu erməni dəstəsi Stepan Stepanyans adlı bir qımdatın rəhbərliyi altında atlanaraq Vağadü müsəlman kəndinə hücum etdilər. Vağadü kəndi Sisyan mahalında yerləşirdi. Orada yaşayanların hamısı müsəlman idi. Erməni dəstəsi kəndi mühasirəyə alırlar. Qabaqcadan hazırlıq görərək silah və patron tədarük etmiş və gizli yerlərdə səngərlər düzəltmiş Vağadü kəndinin əhalisi tez bir zamanda silahlanaraq səngərlərə, damların, daşların dibində müdafiə üçün hazırlanmış mövqelərə girərək erməniləri hər tərəfdən atəşə tutmağa başladılar. Birinci atışmada müsəlman igidləri əlli nəfərdən çox erməni vurub yıxdılar. İkinci atışmada isə ölən ermənilərin sayı yetmişdən çox idi. Üçüncü dəfə onlar «Ya Allah», «Ya Əli, səndən mədəd» deyib daha şiddətli atəş açmağa başladılar və yüz nəfərəcən erməni öldürdülər. Ermənilərə rəhbərlik edən Stepan Stepanyans adlı qımdat karıxıb bilmirdi ki, nə etsin. Bu zaman müsəlmanların atəşindən üç güllə ona dəyib yerə sərdi. Ermənilər öz başçılarının yerə yıxılaraq çabaladığını görən kimi qaçmağa başladılar. Müsəlmanların təqib etdiyi ermənilərin bir hissəsi Stepanyans vurulan yerə gəldilər. Gördülər ki, hələ ölməyib. O, əlindəki tüfəngi götürüb daşa çırpdı ki, müsəlmanlara qismət olmasın. Tüfəngin qundağı sınsa da, özü salamat qaldı. Sonra da əli titrəyə-titrəyə qoynundan bir dəstə əskinas çıxarıb dişi ilə parça-parça etdikdən sonra yıxılıb öldü. İrəli gəlib gördülər ki, həmin əskinaslar yüz manatlıq pullar imiş. Təxmin etdilər ki, onun üstündə bir neçə min manat pul var imiş. Belində də bir onaçılan qəribə tapança var idi. Deyilənə görə, onun qoltuğundan bir kağız da çıxıb. O kağızda bu sözlər yazılıbmış: «Qafqaz ermənilərinin qubernatoru Stepanyans».

Xülasə, ermənilər öz yaralılarını da götürüb getdilər. Bu vuruşmada ermənilər tərəfdən 400 nəfərin öldürüldüyü təxmin edildi.

1323-cü ilin zilhiccə ayının 5-ci günündə ermənilər Əsgəran yolunu bağladıqlarına görə Ağdamdan generalın başçılığı ilə iki dəfə top-tüfənglə silahlanmış qoşunun müşayiəti ilə arabalarla Qalaya azuqə və sursat gətirdilər. General Qalada olarkən Xəlfəli kəndindən gələn müsəlmanlar generala şikayət etdilər ki, ermənilər kəndi atəşə tuturlar. General onların səbirli olmasını məsləhət gördü və ermənilərin cəzalandırılacağını söylədi. General göstəriş verdi ki, bundan sonra kimdə tüfəng, yaxud tapança tutularsa, yəni həmin adam ya üç ay həbs olunacaq, ya da üç min manat cərimə verəcək. Bu məqsədlə general bir dəstə kazakla şəhəri dolanırdılar. Bundan sonra general on iki at qoşulmuş bir divar dağıdan top və xeyli kazakla gəlib hündür bir dağ başında dayandılar. Həmin yerdən ermənilərin bir neçə kəndi aydın görünürdü. General əmr etdi ki, Şuşakəndə, Kərgicahana, Qaybalıya və Daşkəndə həmin topdan atəş açsınlar. Kazaklar həmin topdan bu kəndlərə yetmiş dəfə atəş açdılar. Mərmilər düşən

yerlərdə hər şeyi darmadağın edərək toz-torpağı asimana qaldırırdı. Ermənilər divanxanaya 30-40 nəfərlik nümayəndə göndərib barışıq izhar etdilər. Bundan sonra dükanlar alış-veriş etməyə başladılar. Erməni tayfası müsəlmanlara əziyyət vermək üçün Əsgəran yolunu bağlasalar da, həqiqətdə bu zülmü müsəlmanlara yox, özlərinə edirdilər. Ona görə ki, müsəlmanların evlərində qabaqcadan tədarük etdikləri malları və ərzaqları çox idi. Lakin ermənilər və müsəlmanlar dəyirmanları yandırdıqlarından Qalada un get-gedə azalırdı. Qalada olan qəriblər, miskinlər və kasıblar üçün vəziyyət daha da gərginləşdi. Çünki demək olar ki, bütün çörək dükanları bağlanmışdı. Amma evlərdə və bazarlarda buğda və darı hələ çox var idi. Odur ki, camaat əlacsız qalıb evlərdə əl dəyirmanları, yəni kirkirələri işə salmağa məcbur oldular. Buğdanı əl dəyirmanı ilə çəkib un edirdilər. Bazar və dükanlarda isə bişmiş noxud və lobya satırdılar. Amma əl dəyirmanı az olduğuna görə xalq bir qədər undan korluq çəkirdi. Bir gün təsadüfən qədim evin həyətindən otuz cüt əl dəyirmanı çıxdı. Bu əl dəyirmanı həyətdə torpağa basdırılmış idi. Bunların tapılması xalqın işini yüngülləşdirdi. Belə ki, hər kəs istədiyi vaxt əl dəyirmanını aparıb istifadə edə bilərdi. Amma bu erməni tayfasının bazarında azuqə və yemək tapılmırdı. Əgər müsəlman bazarında və dükanlarında qəndin bir girvəngəsi 6-7 şahı idisə, erməni dükanlarında dörd abbası idi. Müsəlmanlarda buğdanın bir pudu yeddi abbası idisə, ermənilərdə 14 abbası idi. Digər ərzaq malları və əşyalar da müsəlman dükanlarına nisbətən erməni bazarında olduqca baha idi. Odur ki, onlar müsəlmanlardan daha çox korluq çəkirdilər.

Zilhiccə ayının 7-də müsəlmanlarla ermənilər arasında barışıq elan olundu. Bu barışıq ermənilər üçün böyük savab iş kimi qiymətləndirildi. Onlar dəstə-dəstə müsəlman bazarlarına dolaraq dəsmal-dəsmal, çuval-çuval, qoltuq-qoltuq hər cür ərzaq malları, yeməli şeylər, quru meyvələr və bişmiş çörək alıb sevinə-sevinə evlərinə aparırdılar. Sən demə, onlarda heç nə yox imiş. Bir həftədə müsəlman bazar və dükanlarında neçə min manatlıq ərzaq və quru meyvə alveri oldu.

## ƏSGƏRAN YOLU BAĞLANANDA HÖRMƏTLİ ŞƏXSLƏRİN MÜSƏLMAN TAYFASINDAN OLAN ŞƏHƏR KASIBLARINA ETDİKLƏRİ KÖMƏKLƏRİN MİQDARI VƏ ONLARIN ADLARI (1323-cü il)

| | | |
|---|---|---|
| Bakı | Cənab Zeynalabdin Tağızadə | Un 750 pud |
| Bakı | Hacı Zeynalabdin Tağızadə | Qənd, çay 105 pud |
| Bakı | Hacı Zeynalabdin Tağızadə | Şam 2 yeşik |
| Bakı | Hacı Zeynalabdin Tağızadə | Neft 600 pud |
| | Ağa Murtuza Muxtarzadə | 600 manat |
| | Məşədi Xəlil Ağa Həsən oğlu | 500 manat |
| Qarabağ | Cəfər bəy Vəzirzadə | Buğda 100 pud |
| Məşhəd | Qarabağlılar | 2300 manat |

| | | |
|---|---|---|
| Aşqabad | Camaat | 2500 manat |
| Gəncə | Camaat | 700 manat |
| Bakı | Fəhlələr | |
| Bakı | Uşaqlar | |
| Qafqaz | Qarabağlılar | |
| Qazan | Camaat | |
| Şamaxı | Camaat | 318 manat |
| Ordubad | Camaat | 73 manat |
| Ərdəbil | Hacılar | 335 manat |
| Şərur uezdi | Camaat | 43 manat |
| Aşqabad | Camaat | 2600 manat |
| İrəvan | Camaat | 68 manat |
| Rəşt | Camaat | 9 manat |

## PİÇƏNİSLİ KÜRDLƏRİNİN ERMƏNİ TAYFASI İLƏ BAŞ VERƏN ƏHVALATI

Piçənisli Şahqulu Haqverdi oğlu özünün iştirak etdiyi aşağıda yazılan əhvalatı mənimlə (M. M. Nəvvabla) üzbəüz əyləşib danışmışdı.

Piçənis müsəlman kəndindən və başqa kürd müsəlman kəndlərindən 300 nəfərə qədər igidlər və qeyrətli cavanlar toplaşaraq Paşa bəy Murad bəy oğlunun sərkərdəliyi ilə atlanıb Minkəndin üzərinə yeridilər. 160 evdən ibarət olan bu kəndin yarısı müsəlman idi. Paşa bəyin dəstəsi ermənilərin bir qismini öldürdülər və yaraladılar, bir qismi isə qaçıb dağıldılar. Piçənisli müsəlmanlar bu kənddən qənimət kimi 190 baş qoyun, 70 baş at və qatır apardılar. Bundan sonra onlar 200 evdən ibarət olan Xornavar kəndinə hücum etdilər. Paşa bəyin dəstəsi bu kəndə də böyük zərbə vurub qənimət kimi özləri ilə 1010 baş qoyun və 8 at apardılar.

Həmin kürd atlıları qəflətən Zivə kəndinə daxil olaraq ətrafda yerləşən beş erməni evini dağıdıb, mal-qarasını özləri ilə apardılar.

Bir-iki gün keçdikdən sonra həmin dəstə üç yüz erməni evi olan Əliqulu kəndinə hücum etdilər. Onlar həmin kəndin bir tərəfindən daxil olaraq onu yarıya qədər dağıtdıqdan sonra əldə etdikləri qənimətlərlə geri döndülər. Paşa bəyin dəstəsi bir gecə dincəldikdən sonra sabahısı gün Qaladərəsi kəndinə tərəf üz qoydular. Qaladərəsində yaşayan ermənilər qabaqcadan yaxşı silahlanmış və hər tərəfdə səngərlər qurmuşdular. Onlar Paşa bəyin dəstəsini səngərlərdə silahlanmış, hazır vəziyyətdə qarşıladılar. Bir qədər atışmadan sonra Paşa bəyin dəstəsinin bir hissəsi kəndin kənarında yerləşən 23 evi ələ keçirərək oradan 450 qoyun, 60 qaramal və dörd quyu buğda əldə etdilər. Buğdanı atlara yükləyərək mal-qoyunla birlikdə yola düşdülər. Onlar Qalədərəsi kəndindən uzaqlaşanadək Paşa bəyin

dəstəsinin o biri hissəsi ermənilәri məşğul etdilər. Bu atışmada bir nəfər müsəlman həlak oldu. Onlar həlak olan yoldaşlarının cənazəsini götürüb geri qayıtdılar.

Paşa bəyin dəstəsi bir neçə gün istirahət etdikdən sonra atlanıb Cavanşir tərəfə hücum etdilər. Əvvəlcə 150 evdən ibarət olan Küldedik kəndinin üstünə gəldilər. Ermənilər əllərində silah onların qarşısına çıxdılar. Müsəlmanlar «Ya Allah» deyib ermənilərin üstünə töküldülər və bir neçə saat ərzində onlardan yüz nəfərini qətlə yetirdilər. Bununla bərabər, neçə-neçə yaralananları da var idi. Bundan sonra onlar 250 baş heyvan da qənimət götürüb evlərinə qayıtdılar. Müsəlman kəndləri həmin gecə istirahət etdikdən sonra səhərisi yenə də atlandılar. Bu dəfə onlar 60 erməni evi olan Damğalı kəndinə üz qoydular. Onların az olmasına baxmayaraq Paşa bəyin dəstəsinin qarşısına çıxaraq atışmağa başladılar. Müsəlmanlar onların üzərinə hücum edərək karıxdırıb və 90 nəfərəcən ermənini qətlə yetirdilər. Yaralananlar da çox idi. Bundan sonra onlar 200-ə yaxın qaramal və keçi qənimət götürərək geri qayıtdılar. Oradan Badara kəndinin üstünə gəldilər. Bu qorxmaz dəstə orada da 16 nəfər erməni öldürdükdən sonra 60 baş qaramal qənimət götürərək kəndlərinə qayıtdılar.

Gecə yatıb istirahət etdikdən sonra səhər durub atlarını yəhərləyərək atlandılar və Ballıca kəndinin üstünə hərəkət etdilər. Ermənilər onları hazır vəziyyətdə qorxulu qarşıladılar. Atışma başlandı. Hər iki tayfanın səs-küyü və nərələri dağa-daşa səs salmışdı. Bir qədər atışandan sonra müsəlmanlar 30 nəfər erməni öldürüb, neçəsini də yaraladıqdan sonra qənimət kimi 70 baş qaramal, 12 baş at və çoxlu miqdarda əşyalar əldə edərək geri qayıtdılar.

Səhəri günü Paşa bəyin dəstəsi Xənəzək kəndinə hücum etdi, bu hücumdan əvvəl ermənilər öz ağaları Məmmədağa Ataxan oğluna nankorluq edərək evini dağıtmış, bağını qırıb, çobanlarını öldürmüşdülər. 400 baş qoyununu isə yığıb aparmışdılar. Buna görə də ermənilər yəqin etmişdilər ki, müsəlmanlar bunun əvəzini çıxacaqlar. Odur ki, kəndə Qaladan çoxlu silah və kömək gətirmişdilər. Müsəlmanların gurultusu eşidilən kimi onlar səngərə, övrət-uşaq isə gizli yerlərə çəkilib çığırışdılar. Müsəlmanlar onları hər tərəfdən mühasirəyə alaraq güllebaran etməyə başladılar. Atışma dörd saat davam etdi. Dörd saat atışmadan sonra birdən qabaqda haqqında danışdığımız Qasım adlı oğlana güllə dəydi. Onunla bərabər başqa müsəlman igidi də şəhid oldu. Bu iki cavanın qətlə yetirildiyini görən kütlə qəzəblənərək irəliyə atıldılar və erməni səngərlərindən birini ələ keçirdilər. Orada erməniləri öldürdükdən sonra daha bir səngəri də ələ keçirdilər. Vəziyyəti belə görən ermənilər qaçmağa başladılar. Müsəlmanlar 12 evə, neçə-neçə mərəklərə od vurdular. Evlərdən və mərəklərdən qalxan alovu görən ermənilər vəhşətə gələrək bir parası möhkəm yerlərdə gizlənirdilər. Övrət-uşaqların çığırtısı və müsəlmanların «Ya Əli!» sədası dağlara-daşlara düşürdü. 200-ə qədər erməni öldürdükdən və yaraladıqdan sonra kəndlərinə qayıtdılar.

Səhərisi gün Paşa bəyin dəstəsindən səkkiz nəfər seçmə cavan atlanaraq Dəduq kəndinə tərəf çapdılar. Dəduq kəndinin ətrafında yerləşən dörd ev çox əmin

və möhkəm yerdə durmuşdu. Ona görə də burada çoxlu erməni məskən salmışdı. Müsəlmanlar ermənilərin bu evlərdə tutduğu möhkəm mövqeyi dağıtmaq üçün hündür bir yerə çıxaraq oradan bu evləri gülləbaran etməyə başladılar. Onlar dörd-beş nəfər ermənini qətlə yetirdikdən sonra evdəkilər qaçmağa başladılar. Müsəlmanlar qaçanları təqib edərək atəşə tutdular. Onlardan bir neçəsini öldürdülər, bir neçəsini də yaraladılar. Sonra evlərə qayıdıb orada olan əşyaları qənimət kimi götürdülər, erməniləri isə əsir kimi apardılar.

**Ə L A V Ə:** Molla Əhmədli kəndinə xəbər gəldi ki, ermənilər toplaşaraq Quşçu müsəlman kəndinə hücum edərək oranı mühasirəyə alıblar. Molla Əhmədli cavanları dərhal atlanaraq Quşçu kəndinə tərəf çapdılar. Onlar kəndə yaxınlaşarkən gördülər ki, ermənilər Quşçunu mühasirəyə alıblar. Müsəlmanlar kəndin içindən, ermənilər isə çölündən atışırdılar. Kənddə döyüşçülər az olduğuna görə az qalmışdı ki, ermənilər qələbə çalsınlar. Elə bu zaman Molla Əhmədli kəndindən gələn atlılar erməniləri arxadan mühasirə edərək «Ya Əli!» nərəsi çəkib hər tərəfdən onların üstünə güllə yağdırmağa başladılar. Quşçu kəndinin döyüşçüləri «Ya Əli!» nərəsi çəkib erməniləri araya aldılar. Ermənilər vəziyyəti belə görüb onların arasına çaşqınlıq düşdü. Beləliklə də, onlar yavaş-yavaş qaçmağa başladılar. Müsəlmanlar onları güllə və xəncərlə vurub öldürdülər. Bu vuruşmada əlli nəfər erməni öldürüldü, bir qismi isə yaralandı. Qalanları isə qaçıb canlarını qurtardılar. Molla Əhmədlidən olan cavanlar öldürülmüş ermənilərin tüfəng və patrondaşlarını toplayıb Quşçu kəndinin döyüşçülərinə verdilər. Onlar kənd əhlinə təskinlik verib geri qayıtdılar. Yolda onlar ümumi sayı 700 baş qoyun olan ermənilərə məxsus sürüyə rast gəldilər. Molla Əhmədli cavanları bu qoyun sürülərini qabaqlarına qatıb kəndlərinə gətirdilər.

**Ə L A V Ə:** Başqa bir yerdə, yəni Hacısamlı və Piçanlı kürdləri toplaşaraq Gorusun Xənəzək kəndinə hücum etdilər. Ermənilərin qabaqcadan gördükləri tədarüklərinin çox olmasına baxmayaraq, müsəlmanların bu qəfil hücumundan karıxaraq bilmədilər nə etsinlər. Müsəlmanlar onların çaşqınlığından istifadə edərək bir tərəfdən kəndin evlərinə od vurmağa başladılar. Beləliklə, onlar 20 evi yandırdılar. Evlərin alovu və müsəlmanların nərələri göylərə yüksəlirdi. Ermənilər bu hücumun qarşısında davam gətirə bilməyib qaçmağa başladılar. Beləliklə, Xənəzək kəndində 20 nəfər erməni öldürüldü. Müsəlmanlar əldə etdikləri qənimətləri özləri ilə kəndə gətirdilər.

**ƏLAVƏ:** Bu günlərdə generala xəbər verdilər ki, erməni tayfası bir neçə səngər düzəldərək onların hər birində bir və ya iki böyük top gizlədiblər ki, dava zamanı müsəlmanlara və ya ruslara qarşı istifadə etsinlər. Generalın əmri ilə həmin topların bir neçəsi əldə edilib generalın yanına gətirildi. Gördülər ki, toplar atəşə tamam hazır vəziyyətdədir. Generalın əmri ilə həmin toplara lazımi miqdardan artıq barıt doldurub od vurdular. Top elə açıldı ki, sanki onun gurultusundan yer titrədi. Bununla da iyirmiyə yaxın olan həmin topların lülələri bir neçə yerdən partlayaraq yararsız hala düşdü. Həmin toplar dövlətə məxsus olan köhnə

silahlardan idi. Yeni növ toplar gətirildiyinə görə həmin köhnə topların istifadəsi orduda ləğv olundu və hərbi hissələrin hesabından silindi. Həmin topların bir neçəsini Əmrumov alıb balkon sütunu elədi, qalanları dururdu. Ermənilər onları götürüb müsəlmanlara qarşı istifadə etmək üçün hazır vəziyyətdə saxlayırdılar. Hətta sütun yerinə qoyulmuş topları da çıxarıb yararlı vəziyyətə salmışdılar və həmin topları müsəlmanlara qarşı istifadə etmək üçün bir bəhanə axtarırdılar. Girvəngələrin qulplarını sındırıb topdan atmaq üçün hazırlamışdılar. Birinci davada həmin toplardan bir neçə dəfə atəş açdılar. Lakin top necə atıldısa, atanlardan bir neçə nəfəri yaralandı. Generalın əmri ilə həmin topların əksəriyyəti yararsız hala gətirilsə də, hələ bir neçəsi ermənilərdə qalmışdı.

**Ə L A V Ə:** Fərəcan adlı müsəlman kəndində əlyanlılar bir neçə quyuda buğda basdırmışdılar. Bu günlərdə xəbər gəldi ki, əlyanlıların quyularda tədarük etdikləri buğdaların yerini öyrənmiş ermənilər bu məhsulu ələ keçirmək üçün toplaşaraq Fərəcan kəndinin üstünə hücum çəkiblər. Ermənilər quyular yerləşən sahəni ələ keçirdikdən sonra quyuları açıb buğdanı çuvallara doldurarkən əlyanlılar xəbər tutub tez atlanaraq gəlib erməniləri mühasirəyə almışlar. Əlyanlılar iyirmi nəfərdən ibarət olan erməni dəstəsini gülləyə tutarkən onlar qorxuya düşüb yaxındakı dəyirmana qaçdılar. Ermənilər dəyirmanda Əhməd adlı bir oğlanı da öldürmüşdülər. Ermənilər dəyirmanda hiylə ilə daha bir müsəlmanı öldürdülər. Bundan qəzəblənən müsəlmanlar dəyirmanın o biri tərəfindən qaçmaq istəyərkən əlyanlılar ermənilərin on yeddisini öldürdülər. Ermənilərdən biri qaçıb dəyirmanın donuzluğuna girmişdi. Onu da çıxarıb qətlə yetirdilər.

**ƏLAVƏ:** Əhalidən silahların toplanması ilə əlaqədar zilhiccənin 19-da general öz dəstəsi ilə Xankəndinə gəldi. Generalın göstərişi ilə erməni-müsəlman ədavətini qızışdırdığına və ermənilərə gizli silah verdiyinə görə Xankəndində iki dövlətli erməni evlərinə dinamit qoyub partlatdılar. General həmin evlərdə olan topları da götürüb, dəstəsi ilə Malıbəyli kəndinə getdilər. General orada camaata ərz etdi ki, biz silahları yığmaq üçün Dağdağan və Harov kəndlərinə getmək istəyirik. Sizlərdən bizə bir neçə bələdçi lazımdır. Cavanlar ərz etdilər ki, sənin qulluğunda bir neçə nəfər yox, lap yüz nəfər hazır dayana bilər və hara desəniz gedə bilər, lakin bizim tüfəngimiz yoxdur. Generalın göstərişi ilə on nəfər cavana 10 ədəd tüfəng verildi və onlar generalın dəstəsi ilə Harov kəndinə tərəf yola düşdülər. Kazaklar Harov kəndinə çatan kimi onu mühasirəyə alaraq evləri axtarmağa başladılar. Ermənilərin tüfənglərini torpağa basdırmaq istədiyini görən kazaklar silahı onların əlindən aldılar. Kazaklarla kobud rəftar edən ermənilərin birini güllə ilə vurub öldürdülər. Sonra isə onun evini axtarmağa başladılar. Onun evindən Malıbəyli kəndinin əhalisinə məxsus olan neçə ədəd araba təkərləri tapdılar. Tərtib olunmuş akt əsasında vaxtı ilə qarət edilmiş həmin təkərlər kazaklar tərəfindən müsadirə edildi.

Harov kəndində əməliyyat başa çatdırıldıqdan sonra general öz dəstəsi ilə köçəri müsəlman kəndinə tərəf getdilər. Vağzal yolu ilə gedən 2-3 faytonun

axtarılması haqqında general əmr verdi. Bu faytonların hər birində 4-5 ədəd beşaçılan tüfəng, xeyli patron və bir neçə tapança tapdılar. Generalın əmri ilə həmin silahlar müsadirə edilib, sahibləri isə üç günlüyünə həbsə alındılar. Sonra onların hər birindən yüz manat cərimə aldıqdan sonra azad etdilər. Zilhiccə ayının 20-də divanın hökmü əsasında ermənilərdən iki nəfəri (Gerasim Şahnəzərov və Xaçatur Bahadurovu), müsəlmanlardan isə üç nəfəri (uçitel Ağa Mirhaşım bəyi, Cəfər bəy Vəzirzadəni və bir də Ağa Məhəmmədcəfər Muxtarzadəni) həbs etdilər. Divanın hökmünə əsasən bu şəxslər erməni və müsəlman vilayətlərindən kənar bir yerə sürgün edilməlidir. Amma Allahın köməyi ilə bu üç müsəlman hərəsi bir vasitə ilə xilas oldular. Erməniləri isə dörd min manat alıb zəmanətlə azad etdilər. Zilhiccə ayının 28-də Nikolay Zəki oğlu adlı bir erməni müsəlman bazarına gələrək xahiş edir ki, mənə müsəlman məhəlləsində bir dükan və bir ev icarəyə verin. Çünki erməni qımdatları bizim məhəllədə mənimlə düz dolanmırlar, hər ay gəlirlər ki, qımdat pulu verin. Alış-veriş olmayan bir şəhərdə və böyük bir külfət saxlayan adam həm divan pulunu, həm də qımdat pulunu necə versin? Bu gündə olan tək mən deyiləm.

Nikolayın bu hərəkətlərinə görə qımdatlar onu öldürmək üçün fürsət axtarırdı. Axır bir gün səhər tezdən Nikolay dükanını açarkən qımdatlardan dörd nəfər gəlib onu çağırdılar. Nikolay dükanın qıfılı da əlində meydana qımdatların yanına gəlir. Dörd nəfər qımdat ermənilərin gözü qarşısında onu araya alaraq yeddi güllə vururlar. Nikolay yıxılıb canını tapşırdı. Deyilənə görə qımdatlar onun başını kəsib özləri ilə aparmışlar. Bu hadisənin şahidi olan ermənilərdən heç biri cürət edib qımdatlara bir söz deyə bilməmişdir. Bununla da Nikolayın bir dam külfəti başsız qaldı.

**Ə L A V Ə:** Bu günlərdə general və kazaklar bir topla Ağdama gəlmişdi. General ağacdan tikilmiş bir evdən şübhələndiyinə görə onu topla dağıtmaq üçün kazaklara əmr etdi. Kazaklar bu evə topdan atəş açdılar. Topun mərmisi evin bir tərəfindən dəyib, o biri tərəfindən çıxdı. Bu zaman Qala əhlindən olan Abbas adlı bir nəfər generalın yanına gələrək ərz etdi ki, ağa bu mənim evimdir, nə üçün dağıdırsınız? Özüm də Qala əhlindənəm. Mənim təqsirim nədir ki, evimi dağıdıb, məni bədbəxt edirsən? Generalın əmri ilə ev təftiş edildikdən və bazar əhlindən sorğu apardıqdan sonra aydın oldu ki, evdə şübhəli heç nə, yəni silah-sursat olmayıb. Ev isə həqiqətən qalalı Abbasa məxsus imiş. General bundan sonra peşmançılıq izhar edib, oranın hakiminə buyurdu ki, bazar əhlindən yüz manat pul yığıb sahibinə versin.

O günün sabahısı iki erməni iki araba buğda alıb aparırlarmış. Gülablı əhli ermənilərin buğda apardıqlarını eşidən kimi yığışıb onların üstünə gedirlər. Neçə gün əvvəl ermənilər Gülablı kəndini tar-mar edib neçə adamlarını qırdıqlarına görə kənd sakinləri həmin buğda aparan iki ermənini öldürdülər.

**ƏLAVƏ:** 1324-cü il məhərrəm ayının 23-də Sisyan kürdlərinə xəbər gəldi ki, Ağadil kəndində yaşayan müsəlmanlar qəflətən 800-ə yaxın erməni silahlılarının hücumuna məruz qalıblar.

Kəndin müsəlmanları silahlanıb «Ya Əli!» nərəsi çəkərək ermənilərin qarşısına çıxırlar. Müsəlmanlara gələn kömək erməniləri karıxdırıb pərən-pərən etdi. Bir neçə saatın içində 400-ə qədər erməni silahlısı öldürülmüş, qalanları isə qaçıb canlarını qurtarmışlar. Öldürülmüş ermənilərin silah və sursatlarını toplayıb ehtiyacı olan müsəlmanlar arasında bölüşdürdülər.

Məhərrəm ayının 26-da, Novruz bayramı günü özünü qımdatbaşı hesab edən Kolya Əsirbəyov adlı bir erməni belində xəncər yoldan keçərkən bir kazak komandiri onu saxlayıb xəncəri əlindən almaq istəyir. Kolya özünə ar bilib xəncəri ona vermək istəmir. Bu zaman kazak onu bir neçə dəfə vurur. Ermənilər yığışıb birtəhər Kolyanı kazakın əlindən aldılar və kazakı dilə tutub yemək-içmək olan yerə gətirdilər. Kazak içib məst olduqdan sonra ona övrət təklif etdilər. Kazak övrəti istəyərkən ona dedilər ki, bura bazar içidir, yaxşı bir övrət var, onun evinə gedək. Ermənilər məst olmuş kazakı bir yerə gətirib xəncərlə öldürdülər. Fürsət tapıb kazakın cəmdəyini basdıra bilmədiklərinə görə Təzə kilsənin altında olan dəyirmanda gizlətdilər. Hadisədən xəbərdar olan bir malakan gəlib əhvalatı kazaklara xəbər verdi. Onlar tez gəlib öldürülən kazakın meyidini dəyirmandan götürdülər və bu hadisəni teleqrafla böyüklərinə xəbər verdilər.

## GƏNCƏ ƏHVALATI

1324-cü il səfər ayının 9-da Gəncənin müsəlman əhli yığışaraq qubernatorun yanına gəldilər və ərz etdilər ki, bizim dolanacağımız bağlarla əlaqədardır. Artıq bahar fəsli olduğuna görə biz bağlarımızı əkib-becərməliyik. Ermənilər yaşayan yerlərdə olan bağlarımızı əkib-becərməyə yenə ermənilər mane olacaqlar. Siz də razı olmursunuz ki, biz özümüz ermənilərlə görüşüb, aramızdakı ixtilafları yoluna qoyaq. Belə olan halda, biz nə etməliyik.

Qubernator onun yanına gəlmiş Gəncə əhlinə bir neçə silahlı kazak verib bağlara yola saldı. Onlar bağlara çatan kimi ermənilər kazakları və Gəncə əhlini atəşə tutdular. Kazaklar da bir neçə güllə atdıqdan sonra onların hamısı yenidən qubernatorun yanına qayıtdılar. Əhvalatı qubernatora söylədikdən sonra müsəlmanlar qubernatordan xahiş etdilər ki, əgər bizə izn və rüsxət versəniz ermənilərin öhdəsindən biz özümüz gələrik və istədiyimizə nail olarıq. Qubernator müsəlmanların bu sözündən bərk qəzəbləndi.

Bu zaman xəbər gətirdilər ki, ermənilər müsəlmanların bir sürü qoyunlarını çobanların əllərindən alıb apardılar. Qubernator bu xəbərdən daha çox qəzəbləndi və onun əmri ilə kazaklar erməni məhəlləsinə topdan bir neçə dəfə atəş açdılar.

## QARABAĞ ƏHVALATI

**(1324-cü ilin səfər ayı—1906-cı ilin mart ayı)**

Ermənilərin Qarabağda törətdikləri cinayətlər və qırğınlar haqqında hər gün rus dövlət orqanlarına xəbər çatdırılsa da, heç bir tədbir görmürdülər. Nəhayət, Qarabağa bir neçə yüz silahlı kazak göndərildi. Əvvəlcə Ağdama gələn bu silahlı kazaklar ermənilərin fitvası ilə burada müsəlmanlara qarşı ədalətsiz hərəkətlərə yol verdiklərinə görə, böyük qarışıqlıq əmələ gəldi. Kazakların silahsız əhaliyə qarşı açdıqları atəş nəticəsində üç nəfər adam qətlə yetirildi. Həkim Mirzə Məhəmmədin oğlu Mirzə Mehdini də məscidin qabağında dəstamaz aldığı yerdə güllə ilə vurub öldürdülər.

Ağdam əhalisi hadisə ilə əlaqədar yuxarı dövlət orqanlarına şikayət etdikdən sonra hərbi qubernatoru oraya göndərdilər. Qubernatorun Ağdama gəldidiyini bilən kimi camaat meydana toplaşdı. Qubernator camaata müraciət edərək dedi ki, ey müsəlmanlar, bizim padşahımız sizdən çox razıdır. Siz padşahın sağ gözü, kazaklar isə sol gözləridir. Kazakların bu xətalarını bağışlayın. Qarışıqlıq düşdüyündən səhv ediblər.

Hərbi qubernator müsəlmanlara təskinlik verdikdən sonra Ağdama gəlmiş kazakların bir neçə dəstəsini ermənilərə qulaqburması vermək üçün Tağ, Tuğ, Güney və Quzey Çartaz kəndlərinə göndərdi. Kazaklar bu dörd kəndi tüfəng və top atəşinə tutdular və bir çox evlərə od vurub—yandırdılar. Ermənilərin övrət-uşağı ağlaya-ağlaya, çığıra-çığıra kazaklara yalvarırdılar. Kazaklar onların yalvarmalarına baxmayaraq, evlərə girib, əllərinə keçən pulu, qızılı, gümüşü, daş-qaşı və başqa zinət şeylərini qarət edir, qadınların və qızların üstündə olan zinətləri qoparıb aparırdılar. Evlərdə olan sandıqları sındırıb içində olan təzə və köhnə palazların hamısını götürüb aparırdılar. Bir para şeyləri isə çıxarıb bir-birinin üstünə yığaraq od vururdular. Gözəl erməni qız və qadınlarını zorlayaraq ismətlərinə təcavüz edirdilər. Bu əhvalat haqqında Qalaya xəbər çatdıqdan sonra ermənilər pul toplayıb dövlətin böyüklərinə teleqraf vuraraq kazakların yaramaz işlərindən şikayət etdilər.

**ƏLAVƏ:** Kazaklar yuxarıda göstərilən erməni kəndlərini dağıdarkən bir evdən xeyli gümüş pul tapılmışdı. Onlar bu pulların bir hissəsini divana vermiş, bir hissəsini isə camaata satmışdılar. Camaat elə bilmişdi ki, rus puludur. Amma sonra məlum oldu ki, həmin gümüş pullar Yaponiyada hazırlanıbmış. Həmin pullardan biri də mənim (M. M. Nəvvab) əlimə düşmüşdü.

## ERMƏNİLƏRİN PAXILLIĞI VƏ HİYLƏSİ

Yuxarıda göstərildiyi kimi, kazakların Qarabağda ermənilərin başına gətirdiyi müsibətlər və müsəlmanlara qarşı isə hörmətlə yanaşmaları erməniləri çox narahat edirdi. Odur ki, ermənilər paxıllıqdan rahat ola bilmir, onların başlarına gətirilmiş müsibətlərə müsəlmanların da düçar olması və kazaklar yanında hörmətlərini itirməsi üçün tədbirlər tökürdülər. Neçə-neçə erməni qımdatları yığışıb bu fikir ətrafında baş partladırdılar. Xankəndində ermənilər iki rus kişisinə və övrətlərinə üç yüz manat pul verərək onlardan xahiş etdilər ki, müsəlmanların da dövlət yanında müqəssir olmaları üçün bir tədbir görsünlər, bizim kimi kazaklar onların da mal-dövlətini qarət etsin və qadınlarının ismətlərinə toxunsunlar.

Ruslar bu təklifi qəbul edərək ermənilərin məqsədini həyata keçirmək üçün övrətləri ilə arabaya minib Ağdama yola düşdülər. Onlar iki bağın arasından keçən yola çatanda birdən dad-fəryad çəkdilər:

— Ay gəlin, müsəlmanlar bizi soydular, əynimizdə, əlimizdə hər nə var idi, aldılar! Bizi lüt etdilər!

Bu qərarla Ağdam hakiminin yanına gəldilər. O, rus idi. Hakim gördü ki, bu dörd nəfəri elə soyublar ki, əyinlərində alt paltardan başqa bir şey qalmayıb. Hamısı soyuqdan tir-tir əsirlər. Hakim qəzəblənərək əhvalatı dərhal generala yazmaq və müsəlmanları tənbeh etmək istədi. Bu zaman müsəlman olan yasavul osetin hakimin yanına daxil olaraq rusların gəldiyi arabada axtarış aparmaq üçün icazə istədi. Osetin hakimdən razılıq əldə etdikdən sonra gəlib arabanın içindəki otu o tərəf-bu tərəfə çəkib yoxlayanda gördü ki, ruslar və onların övrətlərinin bütün paltarları və çəkmələri otun altındadır. Əhvalatdan xəbərdar olan hakim qeyzlənərək həmin rusların və arabaçının döyülməsi haqqında əmr verdi. Övrətlərə isə dedi ki, bu saat doğrusunu deyin görüm bu nə işdir, yoxsa sizi həbsxanaya göndərəcəyəm. Matuşkalar dedilər ki, bizi nə döyün, nə də həbsxanaya göndərin, əhvalat belədir: Qımdatlar bizə üç yüz manat pul verərək bu hiyləyə təhrik etdilər ki, biz müsəlmanları belə bir əməllə günahlandıraq və bunun nəticəsində ruslar onları cəzalandırsınlar. Biz də bunu edə bilmədik. Hiyləmizin üstü açıldı.

Müsəlmanlar onlara qarşı yönəldilmiş bu hiylənin üstünü açdığına görə xeyli pul yığıb həmin osetinə verdilər və böyük təşəkkürlərini bildirdilər. Beləliklə, ermənilərin növbəti hiyləsi faş olub, rüsvay oldular. Ona görə də atalar deyib ki, başqasına quyu qazanın özü düşər. Yaxud, hər nə əkərsən, onu da biçərsən.

## QAÇAQ ƏSGƏR XANIN ƏHVALATI

1324-cü ilin rəbiüs-sani ayında (may 1906) dövlətin icazəsi ilə köçəri tərəkəmə müsəlman tayfaları çox rahatlıqla öz mal-qoyunları ilə birlikdə gəlib Qalanın ətrafındakı boş yerlərdə dayandılar. Bir gecə-gündüz istirahət etdikdən və lazımi ərzaqları aldıqdan sonra Qalada erməni məhəlləsindən yuxarıdakı qapıdan çıxıb, hər kəs öz yaylaqlarında olan yerlərinə getdilər. Beləliklə, tərəkəmə tayfaları bir-birinin ardınca əmin-amanlıqla gəlib-gedirdilər. Ermənilərdən də bunlara toxunmağa heç kəs cürət etmirdi. Tərəkəmə tayfalarının gəlib-getdiyi bir neçə gün ərzində çoxlu şənliklər və alış-veriş oldu.

Bir gün müsəlmanlar doqquz kəl arabası dolu ərzağı Qalaya gətirib sahibinə verdikdən sonra geri qayıdarkən Ballıca kəndi yaxınlığında yolla gedərkən 30-40 nəfər erməni quldurу qəflətən arabaların üzərinə hücum edərək arabaçıları əsir aldılar, arabalardan isə kəlləri açıb qabaqlarına qatıb apardılar. Ermənilər hücum edərkən arabaçılardan iki nəfəri isə girov götürdülər. Silah gəzdirmək qadağan olunduğuna görə, müsəlmanların heç birində müdafiə olunmaq üçün tüfəng və tapança yox idi. Qalaya xəbər çatdıqdan sonra iş bilənlər teleqram vuraraq əhvalatı böyüklərə xəbər verdilər.

Ermənilər tutduqları doqquz nəfər müsəlmanı əzab-əziyyətlə kəndlərinə gətirərək orada öldürmək istəyəndə camaat mane oldu. Sonra həmin quldurlar tutduqları doqquz nəfəri meşəyə gətirərək zülm və əzabla öldürdülər.

Qaladan bir neçə nəfər erməni və müsəlman tutulmuş doqquz nəfəri azad etmək üçün həmin kəndə getdilər. Yerli ermənilər bəhanə ilə guya gedib bir qədər axtardıqdan sonra gəlib qalalılara bildirdilər ki, onlar öldürülüblər. Bu əhvalat hamıya böyük təsir etdi. Xüsusən çöllərdə dolanan qaçaqlar bu əhvalatdan çox qəzəbləndilər. Qaçaq dəstələrindən birinin başçısı Əsgər xan öz yoldaşlarına bildirdi ki, bu günahsız adamların qanına əvəz almasam, namərdəm. Müsəlmanlar dövlətin nəzərində müqəssir olmasın deyə belə əməllərə yol vermirdik. İndi ki onlar müqəssirdirlər, onların əvəzini çıxmalıyıq.

Əsgər xanın dəstəsi atlanaraq, Yevlax yoluna gəldilər. Uzaqdan gördülər ki, bir neçə dilican arabası gedir. Onlar dilican arabalarına yaxınlaşaraq dayanmasını əmr etdilər. Qorxudan o dəqiqə arabaları dayandırdılar. Arabaları mühasirəyə alıb yoxlayarkən gördülər ki, orada bir qız, üç gənc gəlin, bir qoca övrət, 10 nəfər erməni, bir rus və bir neçə müsəlman vardır.

Müsəlmanlara toxunuayıb, rusdan sual etdilər:

— Bəlkə, sən də ermənisən?

Müsəlmanlar şəhadət verdilər ki, bu, polyak tayfasındandır. Müsəlmanlarla Qalada müştərək davacat dükanı açır. İndi həmin dükan üçün davacat aparır. Əsgər xan polyakdan üzrxahlıq edib, o biri arabalarda əyləşmiş erməniləri və övrətləri əşyaları ilə birlikdə arabadan düşürüb öz mənzillərinə gətirdilər. Ermənilər və övrətlər qorxudan əsirdilər.

Qaçaq Əsgər xan üzünü ermənilərə tutaraq dedi:

— Sizin ermənilərin namərdliklə tutub başına-gözünə vura-vura olmazın işgəncəsi və zülmü ilə apardığı doqquz nəfər müsəlman da sizin kimi canlı, ev və külfət sahibi idi. Məgər sizin içinizdə Allahdan qorxan və insaflı bir adam yoxdurmu ki, bundan sonra belə əzazilliyə, rəzilliyə, cinayətə, nahaq qanların tökülməsinə bais olmağı və xalqın rahatlığını əlindən almağı sizin quldur, binamus və namərd qımdatlara nəsihət etsin? İndi siz əyləşin, yeyib-için və rahatlanın. Əgər ermənilərin apardıqları 9 nəfər müsəlman salamatdırsa, siz də sağ və salamat öz əşyalarınızla çıxıb evlərinizə gedəcəksiniz. Yox əgər onlar öldürülmüş olsalar, siz də onların dalınca gedəcəksiniz.

Nəhayət, bir neçə gündən sonra məlum oldu ki, ermənilərin apardığı 9 nəfər öldürülüb. Qaçaqlar da 10 nəfər ermənini öldürüb dəfn etdilər. Övrətləri isə saxladılar.

## QARĞABAZAR ƏHVALATI

Mirzə Hüseyn Cavad oğlu qarğabazarlı mənimlə (M. M. Nəvvabla) üzbəüz oturub bu əhvalatı özü nəql etdi. O, mənə danışdı ki, ermənilərin müsəlman kəndlərində törətdikləri vəhşilikləri eşidərkən biz hövsələdən çıxdıq və Qarğabazar, Qoçuəhmədli, Pirəhmədli, Qaragüllü və başqa kəndlərdən cavanları və igid döyüşçüləri toplayıb ermənilərin bu vəhşiliklərinin qarşısını almaq qərarına gəldik. Biz silahlanıb erməni kəndlərinin üstünə gedərkən xəbər gətirdilər ki, ermənilər ətraf kəndləri boşaldıb hamısı mövqeyi baxımından möhkəm və yaxşı mühafizəsi olan Xırmancıq kəndinə toplaşıblar. Bütün ətraf kəndlərin kişiləri və övrət-uşaqları da Xırmancıqda cəmləşmişdilər. Ətrafdan gələn ermənilər özləri ilə mal-dövlətlərini də bu kəndə gətirmişdilər.

Erməni kəndlərinin üzərinə getməyə hazırlaşan müsəlman dəstəsi Xırmancıq kəndinə gələrək onu iki tərəfdən mühasirəyə aldılar. Vəziyyəti belə görən ermənilərin bir qismi o biri tərəfdən qaçmağa başladılar. Bir qismi isə məxfi yerlərdə gizləndilər. Müsəlman dəstəsi gözə görünən ermənilərlə atışa-atışa kəndə daxil oldular. Bir neçə erməni öldürdükdən sonra kənddə olan mal-dövlətdən qənimət kimi götürüb özləri ilə geri qayıdanda meşələrdə gizlənmiş ermənilərlə atışmaları oldu və müsəlmanların tamahkarlığı ucundan bir neçə nəfər şəhid oldu. Müsəlmanlar şəhidlərin meyidlərini özləri ilə götürüb geri qayıtdılar.

## 1906-cı İL İYUL AYINDA ŞUŞA ŞƏHƏRİNDƏ BAŞ VERMİŞ ERMƏNİ-MÜSƏLMAN DAVASI

O vaxt ki, böyük dava (1905-ci il) sakit olmuşdu, erməni tayfası müsəlmanların, müsəlmanlar isə ermənilərin bazarına gedir, alış-veriş edirdilər. Hərçənd ki, yollar açıq idi, amma ermənilər yenə düz durmurdular: tək-tək əlsiz-ayaqsız kasıbkar adamları oğurluq ilə tutub öldürürdülər. Müsəlmanlar da onların əvəzini çıxırdılar.

Ermənilər müttəsil (arası kəsilmədən), min cür hiylə ilə hər yerdən hərbi sursat gətirərək, dava üçün tədarük edirdilər. Onlar əlavə maşınlar, nasoslar, tüfənglər, toplar, barıt, bombalar və başqa silahlar cəm edib, daha çox müharibəyə hazırlaşırdılar. Bununla bərabər, onlar gələcək vuruşmaların üsul və yollarını müzakirə etdikdən sonra belə bir qənaətə gəldilər ki, müsəlmanlara sarsıdıcı zərbə endirmək üçün pul qüvvəsinə hiylə işlədilərək rus ordusunun və silahının ermənilərə kömək göstərməsi təmin edilməlidir. Bu hiyləni həyata keçirmək üçün yeganə yol rus generalını pul ilə ələ almaq idi.

Birinci (1905-ci il) erməni-müsəlman davasında sülh və əmin-amanlıq yaratmaq üçün Şuşaya göndərilmiş Qalaşakov (Kalaşakov) adlı bir rus generalı var imiş. Həmin il o, zahirən ermənilərə yaxınlıq göstərməmişdi. Amma indi, ermənilərin məşvərətindən sonra duma qlavası erməni Kiki Kələntərov onu yaxşı öyrənmiş, onunla söhbət edib, ermənilərə qarşı rəğbətini bildikdən sonra generalın Şuşa şəhərində üsul-idarənin rəhbəri təyin olunması üçün onun razılığını almışdı.

Kiki Kələntərov müsəlmanların nümayəndələrini çağıraraq deyir:

— Şuşada bu iki millət arasında ədalətli sülh yaratmaq üçün bir rəhbər təyin etməliyik. Mən çox düşündükdən sonra belə qənaətə gəldim ki, bu vəzifəyə general Qalaşakovdan başqa bir kəsi təyin etmək olmaz. Hərçənd ki, o, əvvəllər bizim erməni tayfasilə yaxşı dolanmadı, kəndlilərimizi tovladı, kazaklar kənd əhlinin övrətlərinə xəyanət etdilər. Amma əlac yoxdur, onu rəhbər təyin edək.

Biçarə müsəlmanlar əvvəllər Qalaşakovdan zahirən yaxşı münasibət gördüklərindən razı oldular. Hər iki tayfanın razılığına əsasən general həmin vəzifəyə təsdiq edilərək, Qalaya göndərildi. Qalaşakov Şuşaya gələn kimi ermənilər məhəlləsində Kələntərovun qabaqcadan hazırladığı iqamətgahda yerləşdirildi. Onun əmrilə elə ilk günlər müsəlman məhəllələrində olan rus ordusunun topları erməni küçələrinə keçirildi, kazaklar və əsgərlər isə erməni məhəlləsi səmtində olan Köçərli məscidinin ətrafında qurulmuş çadırlarda yerləşdirildi.

Hər gecə Kiki Kələntərovun başçılığı ilə, erməni tayfasının hesabına general Qalaşakovun mənzilində kef məclisləri qurulurdu. Kələntərovun seçdiyi və generalın qulluğuna təyin etdiyi 2—3 nəfər xoşsurət erməni övrətləri gecə-gündüz ona xidmət edirdilər. Kələntərov gecə məclisləri əsnasında Qalaşakova və onun kazaklarına neçə min manat rüşvət verərək, Qalaşakova öz məqsədini izhar etdi.

Qarşıdakı erməni-müsəlman davasında rusların onlara kömək etməsini və bu köməyin yerinə yetirilmə yolları ilə əlaqədar tədbir tökməsini generaldan xahiş etdi. Qalaşakovun tədbirilə Kələntərov və qımdatlar ətraf kəndlərə, eləcə də Gəncəyə, İrəvana və başqa şəhərlərə kağız yazıb göndərdilər. Həmin kağızda hər kənddən orta hesabla 30-100 nəfər silahlı dəstələrin Şuşaya göndərilməsi tələb olunurdu. Tezliklə Qalada yeddi min silahlı erməni ordusu hazır oldu. Onların arasında Osmanlı tabeliyində olan ərazidən gələn erməni dəstələri də var idi. Beş ədəd rusların, 6 ədəd isə ermənilərin topları var idi. General və ermənilər qarara aldılar ki, davanı iyulun 12-də başlasınlar.

Rusların istədiyi bu idi ki, bu iki millət bir-biri ilə dava edib, bir-birinə məşğul olsunlar, tainki dövlət fərağat olsun, çünki millətin zəif və kasıb olmağı dövlətin silahıdır.

Neçə gün bundan (yəni, iyulun 12-dən) qabaq səkkiz müctəhid şəriətmədardan fitva gəlmişdi ki, müdafiə və vuruş zamanı başqa millətə əşya, xüsusilə vuruş sursatı və müdafiə üçün lazım olan malları satmaq olmaz. Ona görə cəmi müsəlman tayfası Qalada və başqa yerlərdə ermənilərə ərzaq, taxıl və sair malların satışını dayandırdı. Buna görə ermənilər çox çətinliyə düşmüşdülər. Əhvalatı həddindən artıq şişirdərək, Qalaşakova xəbər verdilər və müsəlmanları təqsirləndirdilər. General çox xatircəmliklə ermənilərə söz verdi ki, bu neçə min ermənilərlə mənim qoşunum müsəlmanları bir sutkada, yəni 24 saatda tar-mar edib, öləni öldürəcək, ölməyənini dağlara, daşlara pərakəndə edəcəkdir.

Bu davanın necə hazırlandığını erməni tayfasının mötəbərləri tam aydınlığı ilə öyrənib (vuruş başa çatdıqdan və barışıq əldə edildikdən sonra M. M. Nəvvaba), özləri danışmışlar. Qalaşakov söz verib ki, onun tədbirilə erməni silahlıları və rus əsgərləri müsəlmanların evlərini, dükan və bazarlarını tamamilə yandırıb, özlərinin qırılanını qıracaqlar, qalanını isə büsbütün Böyük məsciddən aşağı məhəllələrə qovacaqlar. General rus kilsəsindən başlayaraq, Böyük məscidə kimi Rastabazarı, meydanı, Şeytanbazarı və bütün evləri darmadağın edib yandırmağı öz üzərinə götürür. Bundan sonra vuruşun davam etdirilməsini və yaxud müsəlmanlarla barışmalarını ermənilərin öz öhdəsinə buraxmışdır. Kiki Kələntərov Qalaşakovun bu planını qəbul etmiş və generala 10000 manat rüşvət verərək belə ittifaqa gəlirlər ki, generala verilən puldan əlavə padşahlıq rus topunun hər atəşinə 15 manat, çar ordusu əsgərlərinin tüfəngdən atdıqları hər bir gülləyə isə bir manat pul verilsin.

General Kələntərovla əvvəlcədən tökdükləri tədbirə əsasən, rus əsgərləri erməni keşikçilərindən birini öldürərək müsəlman səmtə atdılar və sonra da səs saldılar ki, müsəlmanlar erməni keşikçisini öldürərək başını kəsmiş və tüfəngini də aparmışlar. Qabaqcadan hazırlanmış hiyləyə əsasən həmin vaxt rus əsgərlərindən iki nəfər də gedib, müsəlman məhəllələri tərəfdən ermənilər səmtə güllələr atırlar. Ermənilərin avamları çığırışıb generalın yanına gedirlər və deyirlər ki, müsəlmanlar bir keşikçi öldürüb, erməni məhəlləsinə neçə güllə atıblar. Generalın hiyləsi də bu idi ki, xalqı müsəlmanlara qarşı qaldırsın. Sonra Qalaşakovun əmrilə

erməni tüfəngdarları səngərlərə bölüşdürüldü. Ruslar da dəstə-dəstə gəlib, müsəlmanların səngərlərini mühasirə etdilər. Ruslar və ermənilər müsəlman səngərlərini gülləbaran etməyə başladılar.

Pəs cumada-s-səni ayının üçüncü günü—çərşənbə günü—yəni qərarlaşdıqları kimi, iyulun 12-də qımdatlar generalın məsləhətilə günorta vaxtı davanı başladılar. Əvvələn qımdatın biri, müəzzin axırıncı «la ilahə illəllah» sözlərini deyən məqamda Böyük məscidin minarəsinə bir güllə atdı. Güllə müəzzinə toxunmayıb, minarənin sütununa dəydi. Bunu görən "müsəlmanlar halətdən çıxıb, şaraq-şaraqla dükan-bazarı bağladılar. Yarım saat ərzində tamam silahlandılar və üz qoydular səngərlərə və girəvəli yerlərə. Bu halətdə divan işçiləri və generalın əli altında olan çinovniklər hiylə ilə müsəlmanların içinə gəlib, uca səslə müsəlmanları sakit elədilər ki, bu dava sizinkilərlə deyil, kazaklar ermənilərlə dava edir. Bu general daha bir hiylə işlədərək qabaqcadan lazımi təlimat verib, bir rus zabitini öz dəstəsilə müsəlman məhəlləsində yerləşdirmişdi. Müsəlmanlarla dostluq etdiyinə görə, həmin zabitə inanıb, ehtiram edirdilər. Elə ki ermənilərlə ruslar başladılar müsəlmanları gülləbaran etməyə, müsəlmanların içində olan zabit öz rusları ilə şeypur çalıb səs saldılar ki, dava eyləyən kazaklarla erməni tayfasıdır, bunun müsəlmanlara dəxli yoxdur. Müsəlmanlar onun sözünə inansalar da, yaraq-əsbabları əllərində küçələrə gəlib, vuruşmağa hazır dururdular, amma atan yox idi. Xof arasında qalmışdılar. Gecə düşən kimi od-alov işığı aləmi götürdü.

Biçarə müsəlmanlar bu hiyləyə inanıb, axşamadək səngərlərdə və küçələrdə müntəzir durdular. Elə ki, gecə oldu, bu vədə gördülər ki, Köçərli məhəlləsi tərəfdən od-alov qalxdı. Xəbər gətirdilər ki, general Qalaşakovun əmrilə ruslar ermənilərlə birləşib, Köçərli məhəlləsinin məscidinə və evlərə od vurublar. Bu işıq onun işığıdır. Generalın hiyləsi müəyyən olduqdan sonra xalq karıxıb qalmışdı. Bilmirdilər səngərlərə gedib düşmənə cavab versinlər, yaxud bazar-dükanda olan şeyləri bir yerə daşısınlar. Xülasə, o gecə bütün tüfəngdarlar dükanlardakı malları evlərə daşımaqla məşğul oldular. Ona görə ermənilər və ruslar bir gecə boş evlərə od vurub yandırdılar. İkinci gecədən müsəlmanlar davanı başladılar. Köçərli məscidinin ətrafında hiylə ilə çadır qurub mənzil etmiş ruslar məscidə tərəf gedən iki müsəlmanı — Hacı Abdullanı və Kərbəlayı Əlini güllələyib yıxdılar. Onlara tərəf gedən daha bir müsəlmanı da vurub yerə sərdilər. Ondan sonra gəlib məscidə od vurub yandırmağa başladılar. Məscid od alıb yandıqdan sonra, ermənilər və ruslar Abbas Mirzənin oğlu şahzadə Bəhmən Mirzənin imarətinə gəldilər. Şahzadə Bəhmən Mirzə neçə il bundan irəli İran dövlətində böyük cinayət etdiyinə görə, oradan köç-külfətilə qaçıb, rus dövlətinə pənah gətirmişdi. Rus padşahı hər il ona 36 min manat məvacib verirdi. O, ailəsi və xidmətçilərilə ikimərtəbəli təmtəraqlı bir evdə yaşayırdı. Şahzadə mərhum olandan sonra onun varisləri və xidmətçiləri yenə orada qalırdılar. Amma bu davadan irəli onun oğlanları və ailələri evi bisahib qoyub, hər biri bir yerə getmişdilər. Bu imarəti də gəlib yandırdılar. Daha sonra

Rzaqulu Mirzə bəy Cürminin və oğlanlarının, eləcə də Şuşanın neçə böyük əyanlarının sahibsiz evlərinə, bir sıra hamamlarla birlikdə od vurdular.

Bunlar boş evləri yandırarkən bu tərəfdə generalın kazakları hər bir səngərə dəstə-dəstə bölünmüş erməni silahlıları və xidməti qurtarmış erməni soldatlarilə başladılar müsəlmanları topa tutmağa və nizam qaydasilə tüfənglər atmağa. Bir gecə-gündüzdə dövlətin (rus ordusunun) topundan 120 kərə müsəlmanlar səmtə atəş açdılar. Ondan savayı, ermənilərin özlərinin 6 ədəd topları var idi. Dövlətin toplarının sayı isə beş ədəd idi. Bu 11 ədəd topu səngərlərə qoyub, arası kəsilmədən peydərpey atırdılar.

Dövlət toplarından müsəlmanların üstünə açılan atəşlər zamanı yerə düşən top güllələrini müsəlmanlar götürür, bir yerə cəm edib saxlayırdılar ki, lazım olan yerlərə göstərsinlər və generalın dövlətə və millətə xəyanət etdiyini sübut etsinlər. Çünki o topların gülləsində dövlətin nişanı və nömrəsi var idi.

General özü isə gah bu, gah da o biri səngərdəki topçulara baş çəkərək onların atəşlərinə düzəlişlər verirdi. Bu halətdə ermənilər generalın yanına gəlib, iki müsəlman səngərindən şikayət etdilər ki, bizlərə bu iki səngərdən çox zərər dəyir. Belə ki, onların əlindən bir insan həyatdə və evlərdə hərəkət edə bilmir. Bu səngərlərin biri Gövhərağanın, o birisi isə Hacı Rüstəmin evlərində yerləşirdi. Ağa general dedi ki, buyuraram hər iki səngəri tar-mar edərlər. Sonra generalın göstərişilə kazaklar, ermənilər və rus əsgərləri Hacı Rüstəmin evində olan səngərə doğru hərəkət etdilər. Evin ermənilərə tərəf olan səmti xarabalıq idi. Qırğın başlamazdan bir gün əvvəl generalın tədbirilə gəlib, xarabalıq tərəfdən evin divarının dibindən külünglə yarım arşın qədərində deşik açmışdılar. Müsəlmanlar həmin deşiyi görüb, bir-birinə xəbər vermişlər ki, ermənilər Hacının evinin divarını dəliblər. Bunu bilə-bilə müsəlmanlar səhlənkarlıq edib, nə o deşiyi bağladılar, nə də onun ağzına bir tüfəngdar qoymadılar ki, görsünlər nə olacaq.

Ermənilər ruslarla birlikdə, gizlincə o xarabalıqlarla gəldilər həmən deşik olan divarın yanına. Generalın təliminə əsasən o deşikdən evin içinə bir balaca yeşik atıb, geri qaçdılar. O yeşiyin içində bir partlayıcı maddə var idi ki, onun adına dinamit deyirdilər. Evin içinə atdıqları həmin dinamit partlayıb, ikimərtəbəli imarəti havaya sovuraraq tar-mar etdi. Ondan sonra evə od vurub yandırdılar. Yaxşı ki, bir adama xəsarət yetişmədi. O evdə olan müsəlmanlar qabaqcadan çıxıb, müqabildə olan Hacı Həsənin evinin səngərinə doluşmuşdular.

Xülasə, general sair yerlərdən gəlmiş 7 min erməni silahlılarını, 850 nəfər kazak və rusları tamamilə bölüşdürərək müsəlman səngərlərinin müqabilinə göndərdi. Silahlılarla yanaşı, arasıkəsilmədən atan dövlət (rus ordusu) və erməni toplarının cümləsinin məqsədi məscidlərə rəxnə salmaq və minarələri darmadağın etmək idi. Allaha şükür, bu qədər toplar ki, neçə yüz dəfə atdılar bir insana və heyvana zərəri yetişmədi. Hərçənd ki, top gülləri məscidin ətrafında olan evlərin bir parasının taxtapuşuna, pəncərəsinə və bir para yerlərinə dəyib şikəst elədi.

Amma bu qədər kazak, rus və erməni top və tüfənglərinin müqabilində, ancaq onların yarısı qədər olmasına baxmayaraq, müsəlman tayfası mərdliklə dava edir, səngərlərdə və gizli yerlərdə möhkəm dayanıb, dəstə-dəstə erməniləri və onların səngərlərini gülləyə tutub atışırdılar. Hər dəm nəreyi «Ya Əli!» və uca səslə salavat çəkib, neçə yüz yerdən gurultu ilə gülləni yağmur tək tökürdülər. Əlavə bir topları var idi. Üçüncü gecə həmin topu təkərə mindirərək səngərləri dolandırıb, hər səngərdən bir-iki dəfə erməni səmtə atırdılar. Divanxana qabağından atanda Qız kilsəsinin yanında bir darvazanı dağıtdı. Mamayı səngərindən yuxarı meydana tərəf atanda 18 nəfər erməni yaralandı və öldü. Topun içinə nal parçaları və xırda dəmirlər doldurmuşdular. Bu topu bürüncdən qalalı (şuşalı) bir usta tökmüşdü. Bundan başqa, bir gurultusu var idi ki, atılan vaxt dağ, daş hərəkət edib guruldayırdı. Amma dövlətin və ermənilərin topu belə deyildi. Hər səngərdən qalxan bu topun gurultu qorxusu erməniləri daha çox vəhşətə salır və həyəcana gətirirdi.

O zaman ermənilər İran tərəfdən qoşun gəldiyini və bu topun da onların olduğunu güman eylədilər. Amma bu tərəfdən təsadüfən o gecə və onun sabahısı dalbadal neçə yüz igid və təcrübəli döyüşkən cavanlar sursatla Qalaya daxil oldular. Qala əhli onları artıq dərəcədə ehtiramla qəbul edib, yaxşı mənzillərdə yerləşdirdilər. Amma çox olduqlarına görə, əksərinə məscidi-cameədə yer verdilər. Camaat səhər, günorta və axşam onlara ləzzətli yeməklər verib, rahatlıqlarını təmin etdilər. O gün və o gecə yatıb rahat oldular. Bu igidlərin iki sərkərdələri var idi. Biri Sultan bəy Paşa bəy oğlu və biri də İbrahim bəy Əli Məhəmməd bəy oğlu.

Həmin şəxslər yeyib, içib rahat olduqdan sonra yekdil və yekməqal şəhər əhlinə dedilər ki, bunu bilin, siz şəhər əhli bədənin başı hesabındasınız. Biz kəndistan əhli isə ayaq və sair üzvlər mənziləsindəyik. Başa haradan zərbə gəlsə lazımdır ki, həmin zərbə əl və ayaqla başdan rədd və müdafiə olunsun. Nə qədər ki, baş salamatdır, bədən də salamat olacaq. Əgər əl, ayaq və qeyri üzvlər olmasa da, baş salamat qalarsa, bədən də salamat qalar. Allah eləməsin, başa zərbə yetişsə, bədən tamam öləcək və qeyri üzvlər dəxi bir iş görə bilməz. Bizlər dura-dura siz şəhər əhli belə zəhmətə düşməyiniz bizim üçün nadanlıq və insafsızlıqdır. Lazımdır ki, biz sizin öndə vuruşan dəstəniz olub, istənilən canfəşanlıq əmələ gətirək.

Xülasə, elə ki gecə araya gələn kimi Sultan bəy və İbrahim bəy öz igid cavanlarını dəstə-dəstə səngərlərə bölərək vuruşa başladılar. Sonra onlar salavat çəkib «Ya Əli!» deyə-deyə erməni səngərlərinə hücuma keçdilər və tezliklə onları tutdular. Müsəlman cavanları bu əməliyyatı böyük atışmalar və erməni səngərlərindən onların üzərinə yağdırılan güllələr altında aparırdılar.

Bir tərəfdən də müsəlmanların cavanları və uşaqları pud-pud neft və bağlama-bağlama köhnə əski və cındalar götürüb, üz qoydular Vəzirovların səngərinə. Oradan isə doldular ermənilərin evlərinə. On beş evə od vurdular, lakin cında və əskilər üç gecə-gündüz yağışın altında qalıb islandığına görə həmin

evlərdən yalnız üçü yandı. Bir qismi isə yarımçıq yanmışdı. Bundan başqa Ağadədəli səmtində müsəlmanlar daha iki evi yandıraraq tamam məhv etdilər. Müsəlmanlar bir o qədər ev yandıra bilmədilər, çünki irəlidəki davada erməni tayfasının yarı evlərini, bazarlarını, divanxanalarını və digər imarətlərini tamamilə yandırıb, yerlə-yeksan etmişdilər.

Ermənilərin avadanlıqları yuxarı Xəlfəli qapısı tərəfdə cəm olmuşdu. Müsəlmanların əli də ora yetmirdi. Aralıqda olan məsafə isə tamam xarabalıq idi. Həmin gecə İbrahim bəy öz dəstəsilə «Ya Əli!» nərəsi çəkib, ermənilərin səngərlərinə və evlərinə gülləni yağmur tək yağdıra-yağdıra onların arasından çoxlu adamlar öldürərək irəliləyirdilər. İbrahim bəyin dəstəsi irəlilədikcə erməniləri daha da yuxarılara qovurdular. Bir zaman yandırmağa ləyaqəti olan bir erməni evinə çatan İbrahim bəy qışqıraraq söylədi ki, neft və əski gətirin, bu evi yandıracağam. İbrahim bəy istəyirdi ki, evə od vursun, birdən ermənilər tərəfdən bir havayı güllə gəlib o biçarəyə dəydi. İbrahim bəy «ya Allah!» çağırıb, yerə yıxıldı və orada da canını tapşırdı. Elə ki, İbrahim bəy həlak oldu, ona mənsub olan dəstənin damağı yandı. Kədərli və məyus oradan o məzlumun cənazəsini götürüb, Böyük məscidin həyətinə gətirdilər. O biri dəstələr də bəyin ölüm xəbərini eşidərkən, çox məyus oldular. Elə ki, sabah oldu, bəyi qüsl və kəfən edib, məscidin günbatan tərəfindəki bağçada Şahmar bəyin yanında dəfn etdilər (Allah onları bağışlasın).

Elə ki, gecə aralığa gəldi, atışma yenidən başladı. Hər iki millət gülləni bir-birinin üstünə yağış kimi tökürdülər. Topların gurultusundan, tüfənglərin səsindən və igidlərin nərəsindən evlər və qayalar lərzəyə gəlirdi. Bir müsəlman deyirdi ki, dava vaxtı mən ermənilərin içində yerləşən xəstəxanada yatırdım. Orada xəstəlikdən müalicə olunurdum. Ermənilərin səngərlərindən biri mən yatan otağın pəncərəsinin qabağında yerləşirdi. Pəncərədən müşahidə edib, görürdüm ki, general tez-tez həmin səngərə gəlib rus əsgərlərinə və topçularına göstərişlər verirdi. O, durbinlə baxıb, topçuların atəşini təshih edir, filan məscidə, filan minarəyə atın deyirdi. Onun göstərişilə atılan top güllələrindən biri Seyidli məhəlləsindəki məscidin dəmir taxtapuşundan keçib, onun tavanını şikəst eylədi. Daha bir top gülləsi isə Böyük məscidin minarəsinə dəyib, dörd kərpic saldı.

Qərəz, bu Qalaşakov deyilən general dünya malından ötəri Allahın hökmünə müxalif gedərək öz padşahının qanununa etinasızlıq göstərib, millətə və bir olan Allaha inananlara bu növ xəyanətkarlıq etməyi rəva bilmişdir. Təəccüblüdür, dövlət neyçün bu növ tamah və heyvani-nəfslə iş görən adamları millətə hakim göndərir ki, o da belə qələtlərə yol verir? Əgər bu şəxs və buna bənzər başqası az müddət ərzində bir məmləkətdə belə ədalətsizliklə hökmranlıq etsə, görərsən ki, orada tamam hərc-mərclik baş alıb gedir, məmləkət darmadağın olur. İndiyədək Qafqaz elinə onun (Qalaşakov) kimi qəddar insan gəlməyib.

Müsəlmanlar əvvəlki davada ermənilərin Xoca Söhrab kilsəsini tutmuşdular. Üç gün gecə-gündüz onu əllərində saxlayıb, içində sakin oldular.

Amma bir kəs ədəbsizlik edib, kilsənin bir daşına, yaxud ağacına əl vurmadı, haranısa xarab etməyi özlərinə rəva bilmədilər. Lakin bu amansız erməni tayfası Qalaşakovun xahişinə binaən ruslar ilə birlikdə Köçərli məscidini yandırıb, içində hər nə vardısa qarət edib, dağıtmışdılar.

Bu günün sabahı var. Əlbəttə, Allah-təala öz evinin fikrini çəkəcək, baislərin cəzasını verəcəkdir. Səbr etmək lazımdır.

Əvvəlki davada müsəlmanlar erməni məhəllələrinin yarısına od vurub yandırmışdılar. Nə qədər erməni bu yanğında həlak olmuş və nə qədəri güllə ilə öldürülmüşdü. Qaçanı qaçmışdı, qalanları isə acizanə bir şəkildə ağlaya-ağlaya, keşişlər boyunlarında kəndir, əllərində yeddi aman bayrağı, baş keşiş isə əlində böyük xaç onların önündə məscidə gəlib barışmağı xahiş etdilər. Bu davada müsəlmanlara kəndlərdən çoxlu kömək gəlməsinə və onların qələbə çalmasına baxmayaraq, əgər həqiqəti görən bəsirət nəzərilə dürüst mülahizə etsək, görərik ki, bu davada fəth və qələbə Allahın köməyilə əvvəlkindən çox artıqdır.

Amma bu davada Qalaşakovun tədbirilə müsəlmanlara qarşı ətraf kəndlərdən, İrəvandan, Gəncədən və başqa yerlərdən yeddi min erməni silahlıları, 850 nəfər rus kazakları, 400 nəfər erməni rusları, neçə min Qalada (Şuşada) olan erməni, dörd nəfər məktəbdə oxuyan ünas qızları, eləcə də top və topxana səfərbər edilmişdi. Silahlıların cəmi miqdarı 12 min idi.

Dava başlayanda ermənilərə qarşı vuruşan ancaq Qalada yaşayan müsəlman igidləri və cavanları idi. Onlara heç yerdən kömək gəlməmişdi. Üç gecə-gündüz sərasər müsəlmanlar bu qədər erməni silahlıları və rus ordusu ilə bir atışma apardılar ki, heç yapon müharibəsində də belə dava olmamışdı. Səngərlərdən dalbadal on minə qədər tüfəng və toplar atılır, neçə-neçə yerlərdə evlərə qoyulmuş bomba və dinamitlər partlayırdı. Beləliklə, müsəlmanlar 3 gün Səddi-İsgəndər kimi bu qədər qoşunun qarşısında mərdliklə dayanaraq nərə çəkə-çəkə onları güllələbaran edirdilər. Üç gündən sonra müsəlmanlara kömək gəldi. Bu növ ilə dava beş gün gecə-gündüz davam etdikdən sonra sakit oldu.

Bu beş günlük şiddətli davada müsəlmanlar tərəfdən ölənlərin sayı 16 nəfər idi. Onlardan beş nəfəri adlı, tanınmış cavanlardan, qalanları isə küçə ilə gedərkən, yaxud evinin yanında oturub özünü günə verdiyi yerdə qəflətən ermənilər tərəfindən vurulub öldürülmüş əlsiz-ayaqsız qocalardan və dilənçilərdən ibarət idi. 21 nəfər isə yaralanmışdı.

Amma ermənilər tərəfdən ölənlərin sayı 500-700-ə qədər, yaralananların sayı isə 287 nəfər olmuşdu. Ölənlərin 35 nəfəri Gəncədən və 100 nəfəri İrəvandan, 41 nəfəri tanınmiş qımdatlardan, bəylərdən və məşhur adamlardan, iki nəfəri isə məktəbdə oxuyan ünas qızlarından ibarət idi. Ölənlərin qalanı isə Qaladan və ətraf kəndlərdən gəlmiş adi erməni silahlıları idi. On bir nəfərin isə əl və ayaqlarını kəsdilər. 31 nəfər isə rus qoşunundan olan kazak və ruslardan öldürüldü.

Dava və vuruşmaların qızğın vaxtı ölənləri ermənilər Qalada bulvarın üstündə paltarlı-paltarlı ikisini-üçünü bir qəbrə qoyub dəfn edirdilər. Bəzən isə

nəinki qəbir, adi çala qazıb, oraya basdırırdılar. Kazaklar və ruslar isə rus qəbiristanlığında dəfn edildilər. Müsəlmanların şəhid olanları isə məscidlərin həyətində dəfn edilirdi.

Dava qurtarandan 5-6 gün keçdikdan sonra ağa general müsəlmanların yanına barışığa getmək qərarına gəldi. O, kilsə paltarı geymiş erməni və rus kilsələrinin baş keşişlərini, onlarla bərabər, əllərində ağ və qırmızı bayraq bir qədər rus saldatları və kazaklarını özü ilə götürüb, musiqi çala-çala gəlib müsəlman meydanında durdular. General və keşişlər məscidə gəlib, bu iki millət arasında sülh yaratmaq üçün camaatla danışdıqdan sonra, cənab qazi və onunla bərabər neçə nəfər müsəlman səngərlərə getdilər. Səngərlərə baş çəkə-çəkə erməni meydanına gəldilər. Orada da bir neçə kəlmə danışıb dağılışdılar.

Qalaşakov erməni və müsəlmanlar arasında işlətdiyi bu hiyləyə və ermənilərə verdiyi vədini əmələ gətirə bilmədiyinə görə, barışıq danışıqları uzanır, ondan dövlət böyüklərinə edilən şikayətlər çoxalırdı. Qalaşakov özü də çox ehtiyat eyləyərək düşünürdü: «Bu xəyanət ki, məndən zühura gəldi, qəflətən məni öldürə bilərlər». Ona görə ehtiyatla dolanırdı.

Müsəlmanlar Qalaşakovun dövlətə və millətə etdiyi bu növ xəyanəti və zülmü haqqında teleqraf və kağızla cəmi böyüklərə və divanxanalara məlumat verdilər. Dövlətdən bir imdad, kömək olmadı, generalın cinayətilə bağlı heç bir tədbir görülmədi. Hərçənd ki, Qalanın hakimliyindən çıxardılar. Rəcəb ayının 19-cu günü general Qalaşakov Qaladan çox vahimə ilə çıxıb getdi və onun yerinə Bauyer adlı başqa bir rus generalı təyin edildi. Qalaşakov Tiflis şəhərinə gedib, orada yerləşdirildi. Həmin il şəvval ayının 1-i (noyabr) günbatana neçə saat qalmış bir nəfər hamamdan çıxıb, faytona yavuq gəlir və generala iki güllə atır. General huşunu itirib yıxılır. Bu səsə xalq yığışanda qatil qaçdı. Hərçəndi ki, istədilər onu tutsunlar, ələ düşmədi. Generalı isə götürüb mənzilinə gətirdilər. Qatili isə məlum etmək mümkün olmadı.

Həkimlər gəlib mülahizə edərək dedilər ki, generala iki güllə dəyib. Biri boğazından dəyərək başının içində qalmış, ikinci güllə isə ağzından keçib, dil və dişini parçalayaraq boynunun dalından çıxmışdır. Boynunun dalından çıxan gülləni həkimlər maqqaşla xırda-xırda tamam çıxardılar. Neçə gündən sonra bir məqama yetişdi ki, general yemək yeyə bilmədi. Həkimlər çox səy etdilər, ancaq aqibət faydasız oldu.

## KİTABIN İÇİNDƏKİLƏR

**MİR MÖHSÜN NƏVVAB**

1905-1906-cı İLLƏRDƏ ERMƏNİ-MÜSƏLMAN DAVASI

Nəşriyyatın baş direktoru **Ş. M. Cəfərov**

Şuşa» şirkətinin direktoru **V. X. Quliyev**

Rəssamı **B. Yəhyazadə**

Texniki redaktoru **B. İsmayılova**

Korrektoru **S. Məmmədova, X. İdrisova.**

Çapa imzalanmış 16.07.93. Kağız formatı 84X108 $^{1}/_{32}$.

Şərti çap vərəqi 6,72. Uçot-nəşr vərəqi 6.5. Tirajı 50000. Sifariş 3872.

«Azərbaycan» nəşriyyatı. 370146.

Bakı. Mətbuat prospekti. 529-cu məhəllə.